## MÜNDƏRİCAT

# G İ R İ Ş

*Azərbaycan millətinin mənəvi potensialı orta əsrlər islam dövrü ilə, tarixi Albaniyada yayılmış xristian mədəniyyəti ilə, qədim dövrün zərdüştilik mədəniyyəti və əlbəttə, rudimentləri bizim təhtəlşüurumuzun arxetiplərində çöküb qalmış bütpərəstlik mədəniyyəti ilə əlaqədar olan müxtəlif təbəqələşmələrdən ibarətdir. Tarixi mədəniyyət ilə bağlı bütün bu zəngin irsin dərk edilməsi təkcə bizim yazılı tariximiz sayəsində deyil, habelə tarixəqədərki keçmişimizi öyrənən yeni tədqiqatların istiqamətini müəyyən edir.*

*Tarixəqədərki keçmişimiz haqqında biz maddi mədəniyyət qalıqları, ideologiya, ayin praktikası və azərbaycanlıların milli özgünlüyünün əsasını təşkil edən estetik normaları əks etdirən bədii yaradıcılıq əsərləri əsasında mühakimə yürüdə bilərik.*

*Son onilliklər ərzində bu sahədə toplanmış yeni, çox zəngin faktik və metodoloji material türk etnik birliyinin mənəvi, ayin və estetik normaları kontekstində bizim bütpərəstlik keçmişimizə yenidən nəzər salmağı tələb edir.*

*Əcdadlarımızın etnik siması, mədəni stereotipləri Şərqi Avropadan Şimali Çinə qədər geniş sahələrdə məskunlaşmış çölçü qəbilələrin oturaq, yarımköçəri və köçəri mədəniyyəti ilə sıx əlaqədə və qarşılıqlı fəaliyyətdə formalaşmışdır.*

*Bütpərəst əcdadlarımızın zəngin mərasim komplekslərində heykəltəraşlıq (istər onun monumental, istərsə də kamerli formaları) etnik mədəniyyətin və bədii özünüeyniləşdirmənin ən mühüm funksiyalarından birini yerinə yetirmişdir.*

*Hazırki nəşrdə oxucuların nəzərinə çatdırılan islamaqədərki (bütpərəstlik) heykəltəraşlığı əcdadlarımızın bütpərəst dünyagörüşlərinə uyğun ayin-mərasim praktikası kontekstlərində sərf-nəzər edilir. Bununla birlikdə, əcdadlarımızın etnik və mədəni birliyinin, onların mərasim praktikası və bədii qayda-qanunlarının qədim türk metamədəniyyətinin fraqmenti olduğunu nəzərə alaraq, tədqiqata digər türk xalqlarına məxsus çoxlu miqdarda sinxron heykəltəraşlıq abidələri cəlb olunmuşdur. Bu cür müqayisəli tədqiqat metodu Azərbaycanın bütpərəstlik dövrü heykəltəraşlığının tədqiqində semantik və formal xassələrin çatışmayan halqalarını bərpa etməyə imkan vermişdir.*

# I FƏSİL

## QƏDİM PLASTİKANIN DİNİ-İDEOLOJİ MƏNBƏLƏRİ

Azərbaycanlıların qədim əcdadlarının plastikasının əmələ gəlməsinə və inkişafına təsir göstərmiş bütpərəstlik təsəvvürləri Albaniya tarixçisi M.Kalankatlı ("Ağvan tarixi", B., 1993), Y.V.Çəmənzəminli "Qızlar bulağı", (B., 1964), M.Seyidov "Azərbaycan xalqının etnogenezi haqqında düşüncələr", (B., 1989), B.Abdulla "Azərbaycan mərasim folkloru və onun poetikası", (B., 1990) və bir çox başqa müəlliflər tərəfindən daha dolğun təsvir edilmişdir. Tanınmış türkoloqlar N.L.Qumilyovun, S.T.Yeremeyevin əsərləri və əlbəttə, dünya dinşünaslığının və etnoqrafiyasının klassikləri E.B.Teylorun, C.Frezerin, M.Eliadenin, P.Florenskinin və başqalarının əsərləri bütpərəst mərasim praktikasının rekonstruksiyasına həsr olunmuşdur. Onların əsərləri qədim mədəniyyətə və incəsənətə həsr olunmuş istənilən tədqiqatlar üçün metodoloji əsasdır.

Aydındır ki, bütpərəstlərin bütün mədəni təzahürlərinin əsasında ayin praktikasında təzahür edən ideologiya dayanırdı. İncəsənət, o cümlədən heykəltəraşlıq bu ayinlərin və ideologiyanın ayrılmaz tərkib hissəsi olmuşdur. Lakin, digər tərəfdən, bütün bu inanclar (həm də təkcə kromanyonun deyil, habelə təkcə arxeoloqlara yox, tanınmış etnoloqlara da məlum olan bir çox tayfa və xalqların inancları) hələ dini incəsənətlə, mifologiya ilə, elmlə münasibətdə olan və onlardan fərqlənən bir din kimi əmələ gəlməmişdi. Bu sinkretik ulu mədəniyyət incəsənəti, elmi, ədəbiyyatı, fəlsəfəni və i.a. özündə ehtiva etməmiş, dini də onlardan ayırmamışdı. Daha dəqiq desək, dini elementlər mənəvi və ayini mədəniyyətin başqa elementləri ilə vahid və ayrılmaz bir tam kimi qovuşmuşdu.

Bütpərəstlərin təsəvvürlərində dünya modeli üç pilləli olmuşdur: yuxarı (mərkəzində Qütb ulduzu olan səma), orta (okeanın suları ilə əhatə olunmuş torpaq), aşağı (soyuq və zülmətin axirət dünyası) pillələr. Ağac və ya dağ dünyanın oxudur. Ali tanrı yuxarı zonanın, ruhlar orta zonanın, bədxah qüvvələr aşağı zonanın sakinləridir.

Dünyanın bu ən ümumi və fundamental (kosmos, tsiklik prinsip üzrə aktuallaşan mənzərəsi) memarlıq qurğularının, heykəllərin və dünyanın bu ümumi mənzərəsinin ayrı-ayrı fraqmentlərini maddiləşdirən müxtəlif növ ayin və məişət obyektlərinin yaradılması ilə müşayiət edilən bütpərəstlik mərasim və ayinlərində və mifopoetik təfəkkürdə dərk edilir və konkretləşdirilir. Bu fəsildə ən geniş yayılmış ayinləri nəzərdən keçiririk; həmin ayinlərdə heykəltəraşlığın yaradılması və iştirakı birinci dərəcəli rol oynamışdır.

## *ULU ANA AYİNİ*

Ən qədim ayinlərdən birinin – ulu Ana kultunun meydana gəlməsi artıq son paleolitdə (Orinyak) qeydə alınmışdır. Çoxsyalı Orinyak "veneraları" arasında məşhur Villendorf (Vyana Tarix Muzeyi) Venerası da vardır. O, eramızdan əvvəl 20-ci minilliyə aid edilir.

Daşdan yonulmuş və bütün dünyada tapılmış kiçikölçülü (6–12 sm) çoxsaylı heykəlciklər hələ daş dövründə böyük Ana-İlahə kultunun universal xarakterinə sübutdur.

Arxeologiya daş dövrü dövründə Ana-İlahə kultunun hər yerdə yayıldığına heyrətamiz sübutlar təqdim etmişdir. Pireneydən tutmuş Sibirədək çox böyük bir məkanda daşdan və ya sümükdən yonulmuş qadın fiqurlarını indi də tapırlar. Ən qədimi Avstriyada tapılmış bu heykəlləri şərti olaraq "Venera" adlandırırlar. Onların hamısını mühüm bir cəhət birləşdirir. Əllər, ayaqlar, sifət çox şərti nəzərə çarpdırılmışdır. İbtidai rəssamı başlıca olaraq doğuş və əmizdirmə orqanları cəlb etmişdir. Belə bir ehtimal irəli sürülürdü ki, bəzi müasir bəsit tayfaların qadınları kimi, qədim qadınların da həqiqətən bu cür çox iri döşləri və sallaq qarınları olmuşdur. Lakin etiraf etsək ki, "veneralarda" yalnız realizmə maillik əks olunmuşdur, onda güman etmək lazımdır ki, ibtidai qadınların sifəti yox imiş və çox kiçik əlləri varmış.

*1. Terrakota heykəlciyi. Bakı, e.ə. I minillik.*



Bəzən qadın orqanizminin xüsusiyyətlərinin nəzərə çarpdırılması hətta şarj həddini aşır və heykəlcik artıq başsız qadın gövdəsini təsvir edir; bu gövdədə döşlər və ombalar xüsusilə nəzərə çarpdırılmışdır. Nəhayət, sadələşdirmənin son həddi təsvir olunur – təkcə yalnız döşlərdən ibarət olan heykəlcik təfəkkürə azacıq belə işarə olmadan doğumun və yedirmənin xalis fəaliyyətidir. Bu, "əbədi qadınlığın" ən qədim təcəssümüdür.

"Venera" fiqurlarında qeyri-adi cizgilərin sezilməsinin sirri ondadır ki, tədqiqatçıların böyük əksəriyyətinin düşündüyü kimi, onlar büt təsvirləri imiş. Bunlar İlahə-Ana heykəllərindən, yaxud qoruyucu amuletlərindən savayı, başqa bir şey deyildir.

Qədim totemstik təsəvvürlərin bir çoxunu özündə əks etdirən məhsuldarlıq ayini, sanki, torpağın münbitliyini, ev heyvanlarının çoxaldılmasını və qadın-ananın nəsilvermə qabiliyyətini vəhdət halında birləşdirmişdir. Ayinin icra edilməsi (çox vaxt baharda, lakin bəzən payızda da) adətən bu kultla əlaqəsi olan tanrıların və ruhların şərəfinə dəbdəbəli mərasimlə müşayiət olunurdu. Bu zaman ayin və mərasimlər fallik emblemlərlə və simvollarla bəzədilirdi ki, bu da dölləndirən kişi və nəsilverən qadın başlanğıcını, habelə onların

birləşməsinin böyük yaradıcılıq potensialını nəzərə çarpdırmalı idi. Haqqında söhbət gedən rəmzlər sırasına formasına görə vulvanı xatırladan və həyatverici həmail qismində yüksək qiymətləndirilən kauri çanaqları da aid edilirdi. Neolit əkinçiləri arasında geniş yayılmış, cinsi əlamətləri nəzərə çarpdırılan keramik qadın fiqurları, habelə, az-az olsa da, qucağında uşaq tutmuş qadın fiqurları onların cərgəsinə aid idi. Nəhayət, həmin simvollara qabların ornamental naxışlarında bol-bol rast gəlinir; orada vulvanın çoxlu oval və ya üçbucaqlı təsvirini, torpağa məhsuldarlıq gətirən yağışın sxematik təsvirlərini və i.a. görmək olar. Məhsuldarlıq, artıb-çoxalma, döllədirmə kultu zaman-zaman mifologiyada da əksini tapmışdır: rəvayətlərdə kişi və ya qadın siması alan, bir-biri ilə nikah bağlayan, bəzən olduqca mürəkkəb xarakter kəsb edən, müxtəlif macəralarla, aldatmalarla, şəkildəyişmələrlə və i.a. zəngin olan qüdrətli tanrılara getdikcə daha tez-tez rast gəlinir. Mifoloji süjetlərdə tanrının qadınla əlaqəsi xüsusilə geniş təsvir olunur: təsəvvürə gətirilən, öz kökləri ilə totemizmə gedib çıxan məhz həmin əlaqədən sonralar bu və ya digər etnik birliyin ulu babaları olan əfsanəvi qəhrəmanlar meydana gəlirdi.



*2. Terrakota heykəlciyi. Şəki, Alban dövrü.*

Qayaüstü rəsmlərlə, mağara ibadətgahları və dəfn yerləri ilə yanaşı, qadın fiqurları paleolit dövrü insanlarının mənəvi aləmi haqqında informasiyanın mühüm mənbəyidir. Onlar istər gizli həyat qarşısında, istərsə də gizli ölüm qarşısında əcdadlarımızın ixlaskar qorxusunu nəzərə çarpdırır. Onlar göstərir ki, bəşər tarixinin hələ çox erkən mərhələlərində insanın yaşamaq əzmi mərasimlərin və miflərin çoxcəhətliliyində özünü büruzə verir və təsdiq edirdi; bu mərasimləri və mifləri hələ də yayılmış belə bir inancla əlaqələndirmək qəbul edilmişdir ki, ölülər yenidən doğulma vasitəsilə həyata qayıda bilərlər.

Mərasimlər ümumi rifah xatirinə fövqəltəbii vasitələrin köməyi ilə təbiət qüvvələrini və proseslərini nəzarət altına almaq üçün icmanın istəyi ilə edilən cəhddən ibarət olmalı idi. Qida əldə edilməsi, doğum sirri, nəsilartırma və ölüm ilə bağlı olan müqəddəs ənənə, görünür, indi və gələcəkdə yaşamaq arzusuna cavab olaraq meydana gəlir və fəaliyyət göstərirdi.

Bütün bu mağara ibadətgahları, fiqurlar, qəbirlər və mərasimlər belə bir yeganə mənbənin varlığına inamla bağlı idi ki, insan həyatı da, heyvanların və bitkilərin həyatı da ondan əmələ gəlirdi, bu, Böyük Anna-İlahə, yaxud hər



3. Daş heykəlcik. Abşeron, gec tunc dövrü.

şeyi bəxş edən İlahə idi; biz onunla sivilizasiya tarixinin daha sonrakı dövrlərində də rastlaşırıq. Onlar həmçinin belə hesab etməyə əsas verir ki, bizim qədim əcdadlarımız başa düşürdülər: biz və bizi əhatə edən Təbiət böyük həyat və ölüm sirrinin bir-biri ilə sıx bağlı olan hissələridir və buna görə də bütün təbiətə hörmətlə yanaşmaq lazımdır. Sonralar bu dərketmə onunla nəzərə çarpdırılmışdır ki, İlahənin fiqurları təbiətin rəmzi olan heyvanlar, su və ağaclar arasında yerləşdirilirdi, yaxud bu belə izah edilirdi ki, o özü yarıminsan-yarımheyvan kimi təsvir edilirdi, görünür, bizim itirdiyimiz mənəvi irsdə mərkəzi sima idi. Bəşər varlığının böyük möcüzəsi qarşısında Qadın bədənində təcəssüm edən doğum möcüzəsi qarşısında ixlaskar qorxu və təəccüb də elə bir mühüm məqam idi.

Sorbonnadakı tarixdənəvvəlki və protarixi tədqiqatlar Mərkəzinin direktoru Andre Lerua-Quranın paleolit incəsənətinə həsr olunmuş ən mühüm müasir əsərlərdən birində yazdığı kimi, dövrün etiqadları sistemini "bəsit məhsuldarlıq kultuna" müncər etmək "mənasız və qeyri-kafi olardı". Biz "bütövlükdə paleolit dövrünün bütün təsviri sənətini canlı aləmi təbii və fövqəltəbii təşkilinə baxışların ifadəsi kimi qəbul edə bilərik, – Lerua-Quran vurğulayır və davam edir, – paleolit dövrünün insanları, təbii, heyvanlar və insanlar aləminin bir-birinə zidd iki hissəyə bölündüyünü bilir və güman edirdilər ki, canlı varlıqlar dünyasını bu yarımhissələrin ittifaqı idarə edir" (44.118–120).

Belə güman etmək təbii olardı ki, zahiri dimorfizm, yaxud bəşəriyyətin iki yarısı arasında zahiri görkəmdəki fərqlər paleolit dövrünün əqidələri sisteminə xeyli dərəcədə təsir göstərmişdir. Digər mülahizə də bu dərəcədə təbiidir: insanın da, heyvanın da həyatının Qadın cinsi fərdinin bədənindən əmələ gəlməsinin, ilin fəsilləri və Ay kimi, Qadın orqanizminin tsikillik ardıcıllığa tabe olmasının dərk edilməsi əcdadlarımızı Həyatverici Qüvvələri kişi və Qadın obrazında təcəssüm etdirməyə məcbur etmişdir. Beləliklə, paleolit dövrünün Qadın fiqurları, kauri çanaqları, qırmızı oxra – bütün bunları pərakəndə arxeoloji obyektlər deyil, onun erkən təzahürləridir ki, sonralar inkişaf edib, mürəkkəb dini sistemə çevrilmişdir ki, bunun da mərkəzində bütün canlı varlığın əcdadı olan İlahə-Ananın kultu durur.

"Veneraların" təsvirləri tarixi təbəqələrdə də bol-boldur. Onlar arilərəqədərki Hindistanda, İsraildənəvvəlki Fələstində də, Finikiyada, Şumeriyada

və əlbəttə, bütün Cənubi Qafqazda tapılmışdır. Onların oxşarlığı dərhal nəzərə çarpır. Belə bir təəssürat yaranır ki, Ana kultu, demək olar, universal xarakter daşıyırdı. Uzaq neolit dövrlərinin qalıqlarını qoruyub saxlamış xalqlarda, əslində, hər yerdə ümumi Ananın kultuna rast gəlinir (66.196).

O, Hindistanda Şakti və Prakriti adları ilə məşhurdur. Qədim bir hind mətnində o birbaşa nəsil və doğumla əlaqələndirilir. Harappadan olan bir möhürün üstündə (arilərəqədərki dövr) qadının təsvirini nəzərdən keçirmək olar, onun qoynundan bitki boy atır.

Ön Asiyada və Afrikada Böyük İlahə-Anaya demək olar, yazının meydana gəlməyə başladığı dövrün bütün mədəni xalqları arasında hörmət edilirdi. "Yerin məhsullarını yaradan" həmin İlahə, – misirli İsida, bitkilərin ölümünün dərdini çəkən Kiçik asiyalı Kibela, onun Elladadakı oxşarı Demetra, karfagenli Tanit, sidonlu Astarta, sanki, bütün dünyanı yedirməyə hazır olan ondöşlü varlıq kimi təsvir olunmuş efesli Artemida, – bütün bunlar yalnız qədim Dünya Anasının şəkli dəyişmiş obrazıdır (48.245). Bütpərəst Azərbaycanda "Ana torpaq" sadəcə metaforik əhəmiyyətə malik deyildir. Onlar təbiətin ruhunu, ilahəni, "səma Sahibinin" (Tenqri) zövcəsini ifadə edirdi.

Ali Tanrının qadın obrazının yaranması bizim bütpərəst əcdadlarımızın ideoloji təsəvvürlərində neolit dövründən (eramızdan əvvəl 8–6-cı minilliklər) ardıcıl surətdə müşahidə olunur və onların inkişafının bütün mərhələlərində dünya haqqında monoteist təsəvvürlər təsdiq olunanadək sərf-nəzər edilir.

Azərbaycanın tarixdənəvvəlki keçmişində bu kultun olduğunu göstərən zəngin arxeoloji material bütpərəstlərin ənənələrinin və stereotiplərinin formalaşmasına çox böyük təsir göstərmişdir ki, erkən orta əsrə qədər bütlərdə və məişət əşyalarında ULU ANANIN heykəllərinin və təsvirlərinin külli miqdarda olması buna sübutdur.

Cəmiyyətin dini təsəvvürləri onun sosial həyatına təsir göstərir. Tanrının və axirət dünyasının obrazları insanın gündəlik varlığında labüd əksini tapır. Biz deyə bilərik ki, Tanrıya xas olan nə varsa hamısı yerdəkinin eyni olacaq və ya bu cür olmağa cəhd edəcəkdir. Deməli, Tanrı haqqında təsəvvür labüd olaraq cəmiyyətin özünə münasibətdə ayrı-ayrı stereotipləri müəyyənləşdirir.

*4. Terrakota qadın heykəlciyi. Şomutəpə, Qazax, eneolit.*





*5. Terrakota qadın heykəlciyi. Molla-İsaqlı, İsmayıllı, eramızın I əsri.*

Patriarxal və matriarxal mədəniyyətləri daha diqqətlə təhlil etdikdə biz bunu asanlıqla yəqin edə bilərik. Söhbət kişilərə və qadınlara münasibətlərdəki fərqlərdən, onların başçılığından və prioritetlərindən, ənənələrdə və mədəniyyətlərdə kişinin və qadının rolu və funksiyalarından gedir. Qadın-İlahənin obrazı başqa ənənələri və başqa münasibətləri formalaşdırır, nəinki kişi Tanrısı əsas fiqur kimi çıxış etdiyi vaxt olduğu kimi.

Çoxlu müxtəlif mədəniyyətlər məlumdur ki, həmin mədəniyyətlərdə tanrılar gözümüz qarşısında qadın surətində təzahür edirlər. Bəzi mədəniyyətlər üçün qadın ilahə prioritetdir və ali Tanrı rolunda çıxış edir, lakin çox vaxt qadın ilahələr digər kişi tanrıları ilə bərabər təsəvvür edilmişdir və ali tanrıların hər hansı fərqləndirici funksiyalarını özündə daşımır.

Ana-İlahənin obrazı ali Qadın-İlahənin ən parlaq timsalıdır.

Ana-İlahə dünyanın bir çox mifologiyalarında başlıca Qadın-İlahədir. Artıq xatırlatdığımız kimi, cinsi əlamətləri qabarıq göstərilmiş qadınların üst paleolit heykəlləri Ana-İlahə kultunun mövcudluğuna və ona ehtiram edildiyinə ən erkən sübutlardandır. Anna-İlahə haqqında daha sonrakı təsəvvürlər əzəli ilahi cütlük haqqında təsəvvürlərlə bağlıdır, bu cür ilahi varlıq kainatın və orada məskunlaşmış bütün varlıqların əcdadı olmuşdur (44.67).

Ana-İlahənin başlıca funksiyası yaradıcılıq funksiyasıdır ki, bu da aşağıdakıları ehtiva edir:

– dünyanın yaradılmasında iştirak etmək,
– bütün canlı varlıqların yaradılmasında iştirak etmək,
– məhsuldarlığa himayədarlıq etmək,
– mədəniyyətə, qanunlara, gizli biliklərə himayədarlıq etmək.

Müasir dinşünaslığın beşiyi başında durmuş məşhur antropoloq C.Freyzer özünün “Qızıl budaq” əsərində Allaha bəşəri əlamətlərin verilməsi fenomeninin din tarixinin erkən dövrünə məxsus olduğundan xəbər verir. “İnsan obrazında təcəssüm etdirilmiş Tanrı ideyası nə qədər qəribə olsa da, insan-tanrıda, yaxud tanrı-insanda yalnız və yalnız onun azacıq belə vicdan əzabı çəkmədən cəsarətlə mənimsədiyi ən fövqəltəbii qabiliyyətlərin mövcudluğunun daha yüksək dərəcəsini görmüş ibtidai insanın nəzərində heç bir qeyri-adi şey yox idi” (66.117).

C.Frezerin müşahidələrinə istinad edərək, biz deyə bilərik ki, Ana-İlahə kultu qadının ilahiləşdirilməsinin nəticəsidir.

C.Frezerə görə, canlı insanlarda allahların təcəssümü:

1. Müvəqqəti ola bilər ki, bu da ilhamla, dəyanətlə ifadə olunur və fövqəltəbii bilikdə (peyğəmbərlikdə, öncəgörmələrdə) təzahür edir.

2. Daimi ola bilər ki, bu da adi qabiliyyətin qeyri-adi dərəcədə güclü təzahürü kimi, möcüzələr göstərilməsində ifadə edilir.

Mərasimi funksiyaların qadınlardan kişilərə ötürülməsi məqamı maraqlıdır. Mirça Eliade mifik ənənələrin mövcud olması haqqında danışır ki, bu ənənələr də erkən vaxtlarda dini həyatda qadının mühüm rolu olduğunu göstərir (73.191). Əzəl başdan qadınlara məxsus olan gizli biliklərin və ayinlər tədricən oğurluq vasitəsilə əhalinin kişi hissəsinə keçir. M.Eliade oğurluq və mərasimi qüvvələrin kişilərin əlinə keçməsi nəticələrinin mifoloji qadınlar tərəfindən qəbul olunmasının vacibliyini qeyd edir (73.196).

Ana-İlahə bütün təbii prosesləri idarə edir. Məhz o, yerə dalmış ailəni canlanmağa vadar edir; o, insanlara və heyvanlara məhəbbət aşılayır, yaz qulluğu günlərində quşlar ona mahnılar oxuyur. Onun işarəsi ilə güllər açır və meyvələr əmələ gəlir. Onun sevinci bütün canlı varlığın sevincidir; onun gözləri lacivərd səmadan bizə baxır, onun əli yarpaqları şəfqətlə oxşayır, o, bahar küləyində dünya üzərində pərvaz edir.

İndi belə bir fakt başa düşülür ki, qədim zamanlarda (bəzi xalqlarda) kahinlik funksiyaları, əsasən, qadınlara məxsus idi. Məsələn, şimalda yaşayan hindilər arasında dua mərasimi qadınlar tərəfindən icra olunurdu. Bəzi hindilər arasında belə bir rəvayət vardır ki, "məhsuldarlıq ayinləri" qadınlar tərəfindən təsis olunmuşdur. Bir irokez rəvayətinə görə, əkinçiliyin banisi olan ilk qadın ölərkən öz cənazəsini yerlə sürüməyi vəsiyyət etmişdi və onun torpağa toxunduğu yerlərdə bol məhsul yetişirdi. Şaman qadınlar və kahinlər ən bəsit bitkiləri tanıyırlar. Bu halın yoxa çıxdığı yerdə onun izlərini tapmaq olar. Məsələn, çukçalarda və digər şimal xalqlarında kişi qadın paltarı geyərmiş. Krit adasının müəmmalı freskaları isə buna dəlalət edir ki, kişi ən müqəddəs məqamlarında qadın paltarı geyinməli idi.

Qadın da deyil, bəs kim dünya Anasının canlı təcəssümünü ayin sirlərini əllərində tutmalıdır? O öz bədənində doğumun sirrini daşımırmı? Dində qadınların başçılığı qallar, qədim germanlar və bir çox digər xalqlar arasında qəbul olunmuşdu. Dionis ayinlərinin beşiyi ba-

*6. Terrakota heykəlciyi. Təpə-Sərab, Cənubi Azərbaycan, neolit.*





*7. Terrakota heykəlciyi. Mingəçevir, eramızın I-II əsrləri.*

şında dayanmış məhsuldarlıq kultuna da qadın kahinlər başçılıq edirdilər...

Cadugərlər, cindarlar və ifritələr haqqında saysız-hesabsız xalq inancları yalnız o qədim dövrlərin əks-sədasıdır ki, o vaxt qurbanvermə, qarğışlar və magiya qadınların əlində idi.

Tamamilə təbiidir ki, qadınların belə mühüm kult əhəmiyyətinə malik olduğu şəraitdə onlar çox vaxt qəbilələrin rəhbərləri və başçıları rolunda çıxış edirdilər.

Qadınların bütün ilahi simaları vahid ilahənin bir növüdür və bu ilahə dünyanın qadın başlanğıcıdır, absolyut dərəcəsinə qaldırılmış bir cinsdir".

Qadın-İlahə ümumi ulu anadır. Bitkilər, heyvanlar, insanlar onun qoynundan çıxmışlar. Buna görə də ibtidai insanın təfəkküründə qohumluq hissi yaşayır ki, bu da bütün canlı varlıqları birləşdirir (20.117–123).

Qadının ən erkən daş heykəllərindən biri Azərbaycanda tapılmışdır. Bu heykəl mezolit dövrünə aiddir və Qobustanda "Kənizə" məskənində aşkar edilmişdir (49.41). Bu heykəlin təsvirinin xarakteri yuxarıda təsvir olunmuş paleolit "veneraları" ilə eynidir. Başın və üz cizgilərinin işlənilməməsi, döşlərin, qarının və ombaların mübaliğəli təsviri oxşar heykəltəraşlıq obrazlarının bütün dünyaya yayılmasının ideoloji "qanunlarının" universallığını göstərir.

Qadın heykəllərinin daha çoxlu miqdarda olması neolit dövrünə aiddir. Mezolit dövrünün sonunda və əkinçiliyin meydana gəlməsi və inkişafı, ibtidai cəmiyyətlərin matriarxal əsaslarının yaranması Ana-İlahənin inkişaf etmiş kultunu yaratmışdı. Bu kult heykəltəraşlıq obrazlarında əks olunmuşdur.

Qadınların neolit dövrünə məxsus fiqurları Şomu-təpə, Qarğalar təpəsi (Qazax rayonu), İlanlı təpə (Qarabağ), Təpə-Sərob (Cənubi Azərbaycan) və başqa yerlərdə külli miqdarda aşkar edilmişdir. Bütün bu fiqurlar kiçik ölçülüdür, bişmiş gildən hazırlanmışdır və məhsuldarlığın artırılması ilə əlaqədar olan ayinlərin izlərini özündə saxlamışdır. Şomu-təpədən (Qazax) tapılmış qadın fiquru buna sübutdur. Bu fiqurun ombalarında və qarnında sıxılmış buğda dənlərinin izləri vardır. Heç bir şübhə yoxdur ki, fiqur hazırlanan zaman onu buğda dənələrinin içərisində diyirlədərək, sonradan ocaqda bişirmişlər. Bu ayin məhsuldarlığı artırmaq üçün keçirilirdi.

Azərbaycanda gil qadın heykəllərinin miqdarı tunc dövründə kəskin surətdə azalır (eramızdan əvvəl 3–2-ci minilliklər) ki, bu da matriarxatın patriarxatla əvəz olunması və cəmiyyətdə kişilərin rolunun artması ilə izah olunur.

Bütpərəstlik dövründə qadın heykəllərinin inkişafında sonuncu sıçrayış Azərbaycan tarixində Albaniya dövrünə təsadüf edir. (eramızdan əvvəl 4-cü

əsr – eramızın 7-ci əsri). Bu dövrün gil qadın heykəlləri Molla-İsaqlıda (İsmayıllı rayonu), Çuxur-Qəbələdə (Qəbələ rayonu), Xınıslıda (Şamaxı rayonu) və bütpərəst Albaniyanın bir çox digər yaşayış məskənlərində aşkar edilmişdir.

Yuxarıda sadalanmış qadınların bütün heykəltəraşlıq təsvirləri məhsuldarlığı təmin edən ilahə kimi qadın heykəllərinin rolunu yenidən işıqlandırmağa imkan verir. Bu gil heykəllərin aşkar olunduğu yerlər də bunu göstərir; həmin heykəllərin böyük əksəriyyəti ocaqların yanında və mənzilin girəcəyində (qapının kandarında) döşəmənin altında aşkar edilmişdir.

Sadalanan qadın heykəlciklərinin heç birində qadın obrazının estetikləşdirilməsi müşahidə olunmur. Bu heykəllərin çox vaxt başı, üz cizgiləri yoxdur, onların, demək olar, hamısı yer üzündə yaşayan qadının deyil, ilahənin çılpaq təsvir edilməsinin tələb olunduğu kimi, geyimsiz təsvir edilmişdir.

Bu heykəllərin bir çoxunun tipoloji cizgilərinin müqayisə edilməsi regiondan asılı olmayaraq, belə heykəllərin yaradılması zamanı formaəmələgəlmə prinsiplərinin universallığına dəlalət edir. Mövcud fərqlər daha çox heykəllərin yapılması, formaya salınması və ya dekorasiyalaşdırılması üsullarında təzahür edən lokal üslubi fərqlərlə bağlıdır. Cənubi Azərbaycanda (Təpə-Sərob), Suriyada və Türkmənistanda aşkar edilmiş heykəllərin eyniliyi bunun timsalı ola bilər.

Azərbaycanda tapılmış heykəllərin asanlıqla nəzərdən keçirilə bilən analogiyaları heç də təkcə qədim Şərq sivilizasiyalarında deyil, habelə daha şimal (məsələn, Ukrayna (Tripolye) olduğu kimi) sivilizasiyalarında müşahidə olunur ki, bu da Ukraynanın cənubu (Tripolye), Qara dəniz hövzəsi (Anadolu) və Cənubi Qafqaz) məskunlarının ən qədim etnomədəni birliyi haqqında fikir yürütməyə imkan verir. Bu regionlarda aşkar edilmiş, neolit dövrünə məxsus heykəllər həm mahiyyətinə, həm də formasına görə biri-birinə son dərəcə oxşayır.

Çox vaxt daşdan hazırlanmış, paleolit və mezolit dövrlərinə aid olan heykəllərdən fərqli olaraq, neolit dövrünün gil heykəllərində, əsasən, bədənin uşaq doğuşu ilə əlaqədar olan, uşağın doğulması və məhsuldarlıq ilə bağlı olan magik ayinlərin yerinə yetirilməsini göstərən hissələrini örtən döymə (tatou) işarələr meydana gəlir.

Albaniya dövründə (e.ə. 4-cü əsr – eramızın 7-ci əsri) döymə (tatou) işarələr yazılar qadın yumurtacıqlarının bolluğunun simvolu olan apotropik ərplərlə əvəz olunur ki, bu da uşaq doğumu orqanlarının və əmizdirmə orqanlarının (qasıq, qarın, döşlər) qorunmasının rəmzi kimi təzahür edir.

Bölməyə yekun vurarkən inamla qeyd etmək olar ki, Ana-İlahə obrazı bütün qədim sivilizasiyalar üçün universal xarakterə malik olmuşdur. Onların plastik xarakteristikalarına gəldikdə isə, yəqin, onlar lokal cizgilərə malik imişlər, bu isə heykəllərin ideoloji qanunlarının və onların yapılması üsullarının xüsusiyyətlərindən irəli gəlirdi.

## *NƏSİL HİMAYƏDARLARI – ULU ATALAR (ƏCDADLAR) AYİNİ*

Zəmanəmizədək qorunub saxlanmış əcdadların kultu (ölmüş qohumların ruhlarına ehtiram), dünyanın bir çox xalqlarında olduğu kimi, ən parlaq ifadə olunmuş animistik kultlardan biridir. Qədim Azərbaycanda əcdadların ruhlarına həmişə müəyyən ehtiram və diqqət yetirilirdi. Onlar vaxtaşırı qurban kəsirdilər, bu zaman həmişə ruhların daimi himayədarlığına inam mövcud idi.

Əcdadlar kultunun təzahür formaları çox rəngarəngdir. Dəfn mərasimi müxtəlif şəkildə icra olunurdu. Ölənlərin cəsədləri torpağa basdırılır, kremasiya edilirdi və i.a. Türk xalqlarının mifologiyası ölümün təbiəti haqqında, ölmüş əcdadların ruhlarının sağ qalmış adamlarla qarşılıqlı münasibətləri haqqında təsəvvürlərlə bağlı olan süjetlərlə doludur.

Məsələn, türk xalqları hesab edirlər ki, insanın bədənini həmişəlik tərk etmiş ruh bir neçə gün doğma kəndin ətrafında dolaşır, öz evinə daxil olur və dəfn ayinlərinin icrasını müşahidə edir. Əgər ölmüş adamın ruhu qurban kəsilməsindən və mərasimlərin iştirakçılarının davranışından razı qalırsa, o sonralar qohumlarına yardım göstərəcək və havadarlıq edəcək, əgər belə deyildirsə, onlara fəlakətlər və xəstəliklər göndərəcəkdir. Sonra yeraltı dünyada məskən salan ruhlar yerdəki həyatdan az fərqlənən həyat tərzi keçirirlər. Onlar evlərdə yaşayır, bu və ya digər ləvazimatdan, silahdan istifadə edir, bəzək əşyaları taxır, yeyir, içir, yatır, bir-birindən küsürlər.

Azərbaycanın bütpərəstlərə məxsus məzarlıqlarında qədim qəbir inventarının, məişətdə işlədilən əşyaların olması söylənilmiş fikri təsdiq edir. Ruhlar vaxtaşırı özlərini və dirilərin onlara qayğı göstərmək vəzifəsini xatırladırlar, onların yuxularına girir, yaxud xəstəliklər törədirlər.

Qədim türk təsəvvürlərinə görə, oğul atadan, nəsillər isə ümumiyyətlə, əcdadlardan xüsusi həyat qüvvəsi alırlar. Əcdadlara ehtiram ayininin son dərəcə səmimi, mərasimdə onların real iştirakını hiss etməklə icra edərək, sanki, bu həyati qüvvəni stimullaşdırır, qidalandırırdı, bu isə mömin nəslin həm mənəvi, həm də fiziki tərəqqisinə kömək edirdi.

İstər Hind-Avropa, istərsə də Cənubi Qafqaz mədəniyyətlərinin inkişafı türk-monqol mərhələlərində onların kult praktikasında iki əsas istiqamət üstünlük təşkil edirdi. Birinci istiqamət dəfn və xatirə ayinləri idi ki, onları "əcdadların kultu" məfhumu ilə bir qədər şərti birləşdirmək mümkündür.

İkinci istiqamət təbiət ruhlarına, qüvvələrə ehtiram kultlarıdır. Bu ayinlərin icrası nəticəsində miras qalmış çöl arxeoloji abidələrinin məqsədyönlü tədqiqatları hələ yenicə başlanır. Kultun inkişafının bu hər iki istiqaməti kult yerinin dominantı və maddiləşmiş əcdadın, nəslin yaradıcısı və müdafiəçisinin (demiurq) təcəssümü olan daş heykəltəraşlıq obrazlarının yaradılması və qurulması ilə müşayiət edilmişdir.

Hətta bütün çöl mədəniyyəti (o, Azərbaycanın geniş çöllərində də yayılmışdı) massivində onların aşkar edilməsi olduqca qeyri-adi bir vəzifədir. Bu abidələrin tapıntıları, bir qayda olaraq, çoxsaylı deyildir, sonralar yayılmış İslamın onlarla uzunmüddətli mübarizəsi nəticəsində meydana çıxmış, əldə edilən materiallar isə birmənalı təfsirə çətinliklə gəlir. Lakin onlar qədim ayinlərin yeganə etibarlı şahidləridir və elə bir həddən kənarda keçmişə nəzər salmağa imkan verir ki, ondan sonra yazılı mənbələr üzə çıxır. Bundan əlavə, landşaftda yer almış qədim heykəltəraşlığın bütpərəstlik abidələri müasir çölün simvolik strukturu ilə qovuşur.

Əcdadlarımızın təsəvvüründə insandan ayrı mövcud olan xüsusi həyati qüvvə haqqında təsəvvürlərə əsaslanan yenidən şəkildəyişmə xüsusi yer tuturdu. Fəaliyyət göstərən, hərəkət edən, düşünün canlı insana və zahirən diri adamı xatırladan, lakin hərəkətsiz qalan, hissiz olan ölüyə, meyitə məxsusdur, çünki həyati qüvvə ("ruh") ondan ayrılaraq, çıxıb gedirdi. İnsan öləndə, qədim türklərin təsəvvürlərinə görə, onun ruhu "tüstü" kimi bədəndən ayrılıb gedirdi. Qədim insanların təsəvvürünə görə, bu ruhların taleyi müxtəlifdir. Onların bir hissəsi yer üzündə qalaraq, xeyir və şər doğurur, digər hissəsi səmaya qalxaraq, nəsillərin həyatına təsir göstərməkdə davam edir. Həmçinin belə hesab olunurdu ki, ölənlərin ruhları heyvanlarda, əşyalarda özünə sığınacaq axtarır, buna görə də bir çox müalicə üsullarını heyvanlarla bağlayırlar: onların başının yanında, alnında küçüyü oturdurdular, qızdırma zamanı onunla yanaşı keçini bağlayırdılar və i.a.

Məlum olduğu kimi, çöl mədəniyyətinin daşıyıcıları (Avrasiya türkləri) əcdadların kultunun xüsusiyyətlərinə Uzaq Şərq ilə, xüsusən, Çin mədəniyyəti



*8. Daş kurqan heykəli.*
*Abşeron, gec tunc dövrü.*

ilə mədəni əlaqələr xeyli dərəcədə təsir göstərmişdir. Bununla əlaqədar olaraq əcdadların kultunun təbiəti haqqında bəzi konfutsiyaçıların mühakimələri kifayət qədər maraqlıdır:

Məlum olduğu kimi, əcdadların arxaik kultunu qoruyub saxlayan və aliləşdirən Konfutsi onu prinsipcə etik məzmunla zənginləşdirmişdir. Konfutsinin özünün əcdadların ruhlarının ölməzliyinə inanıb-inanmadığını biz bilmirik. O və şagirdləri bu barədə mühakimələr yürütməkdən çəkinirdilər. Onlar deyirdilər: "Bilmirik ki, həyat nə deməkdir, biz haradan bilək ki, ölüm nədir". Hər halda, əcdadların ölümdənsonrakı aqibəti haqqında Müəllimin heç nə demədiyi varlıq sahəsinə aid idi (tszı bu yue). Bununla birlikdə, onun ardıcıllarından hər birinə əcdadlara ehtiram göstərmək tapşırılmışdır. Nə üçün? Əvvələn, Şərq etikasının son dərəcə qiymətləndirdiyi oğul ehtiramı tipli ailəklan xeyirxahlıqlarının mənəvi təkmilləşdirilməsi və inkişafı üçün (syao), lakin təkcə bunun üçün yox. Konfutsinin təsəvvürlərinə görə, oğul atadan (və nəsillər, ümumiyyətlə, əcdadlardan) xüsusi növ "tsi" (həyati qüvvə) alır. Səmimiliyin var qüvvəsi ilə ("çen"), mərasimdə onların real iştirakının hiss edilməsi ilə əcdadlara ehtiram ayininin icrası bir növ bu həyati qüvvəni stimullaşdırır, qidalandırırdı ("yan") ki, bu da mömin nəslin həm mənəvi, həm də fiziki tərəqqisinə kömək edirdi. Bu cür konsepsiyalar isə, transfərdi hisshəyəcanlar vasitəsilə bu və ya digər kultların varlığının əsaslandırılmasına kifayət qədər yaxın idi. Heç bir şübhə yoxdur ki, türk xalqlarında biz əcdadlara analoji münasibətlə qarşılaşırıq.

Ənənəvi mədəniyyətlərdə ayin (kult praktikası) dünyanın ekzistensial qavranışının praktik realizəsinin formasıdır, o, bu dünyaqavranışının fenomenal reallığında təcəssüm üçün insan fəaliyyətinin əsas formasıdır. Bununla bərabər, kult praktikası ənənəvi mədəniyyət sisteminin fəaliyyətində əsas rol oynayır, çünki onda insan şüuru üçün ziddiyyətlərin simvolik aradan qaldırılması ifadə olunur. Yalnız ayində varlığının tamlığının və onun haqqında biliyin tamlığının yaşanılması mümkün olur; bu isə bir nemət kimi başa düşülən və həmin nemətin mərasimi daşıyıcısı kimi bir ideyaya aid edilir. Onun bütün intensivliyində bu mövcud hiss-həyəcan xüsusi həyati dolğunluğu ilə insana məlum universumda kök salmasını duymağa, müəyyən qaydanın, rifahın qanunauyğun, idarəolunan sferasına cəlb edilmənin dərk edilməsi hiss etməyə imkan verir (64.17).

Əcdadlara ehtiram göstərilməsi ilə bağlı olan arxaik ayin kollektivin bütün üzvlərinin iştirakını nəzərdə tuturdu, həm də tamaşaçılardan daha çox iştirakçıların olmasını nəzərə alırdı. Bununla yanaşı, o, sonralar bunun necə baş verdiyini, ayin fəaliyyətinin sərt institusionallaşdırılmasını güman etmirdi. Bununla bərabər, əşyaların dilindən ayinlər, başlıca olaraq, digər dillərdə, o cümlədən sözlərin köməyilə bu dərəcədə adekvat ifadə edilə bilməyən ideyaların, məfhumların, dəyərlərin ifadəsi üçün istifadə olunurdu (23.83). Ayinin kompozision və semantik mənasını qurbanvermə təşkil edir, bu onun başlıca,

gizli siniridir. İstənilən qurbanvermə ayinində günahyuma notu gizli surətdə mövcuddur (64.38). Bununla yanaşı, ayində qurbanlığın simvolik mənası əsas rol oynayır. Buna görə də ayin çərçivəsində qurbankəsmə heç də təkcə heyvanın və ya insanın ayin tələbi ilə öldürülməsi deyil, heç də təkcə xüsusi əşyaların və ya substansiyaların gətirilməsi deyildir. Artıq ritual tikilinin inşası edilməsi özü də bir növ də qurbanvermədir, elə bir qurbanlıq ki, orada ayin icra olunur. Ayin fəaliyyəti gedişində və ayinlərin icrası üçün kult abidələri (müqəddəs yerlər, idollar), bir tərəfdən, ayinin icrasının şərti və digər tərəfdən, onun məzmunu idi.

*9. Daş heykəl. Abşeron, dəmir dövrü.*



Təbiət qüvvələrinə və kortəbii qüvvələrə ehtiram edilməsinə yönəldilən arxaik kult abidələri formalaşdırılmış, institusiallaşdırılmış dinlərin daha sonrakı ehramlarından və məbədlərindən stadial surətdə fərqlənirdi. Erkən, arxaik bütpərəstliyin stadial surətdə təbiət qüvvələrinin qavranılması və onlara ehtiram sistemləri üçün xüsusi təşkil olunmuş məkandan kənarda, məsələn, dağlar kimi ən parlaq təbiət obyektləri ilə bağlı olan açıq yerlərdə kult praktikasının icrası səciyyəvi idi (60.19).

Bununla bərabər, tikililər – müqəddəs yerlər, daş idollar – maksimum lakonik idi və landşaftların təbii sistemi ilə yaxşı uyuşaraq, dünyanın ekzistensial qavranılan strukturunu aşkara çıxarır və bu strukturun əsas obyektlərinə çevrilirdi.

Bütpərəst mədəniyyətlərdə əcdadlara ehtiramın bildirilməsi ilə bağlı kult yerlərinin müəyyənləşdirilməsi üçün real landşaftın ən parlaq, mərasimi əhəmiyyətli obyektləri seçilirdi. Kult praktikasının realizəsinin bu yerləri, ən əvvəl, insanı əhatə edən dünyanın həqiqi obyektləri ilə bağlı idi, çoxlu məna ilə dolu canlı, daim fəaliyyətdə olan bir dünya kimi qavranılırdı.

Bu abidələrin ən erkənləri (neolit və tunc dövrü) skif dövrünə yaxınlaşdıqca

tədricən əcdadın-insanın obrazı ilə daha çox uyğunlaşan antropomorf cizgiləri kəsb edən kult sütunlarından ibarət idi.

Mərkəzi Asiya çöllərində əcdadlara ehtiramla bağlı olan kult praktikasının keçirilməsinin ən parlaq şahidləri əcdadların kultunun plastikasının inkişafının bu hər iki mərhələsini nümayiş etdirən heykəltəraşlıq abidələridir. Bununla bərabər, bir sıra müəlliflər hesab edirlər ki, bu daş heykəllər ölü əcdadlara ehtiramın obyekti idi. Onlar konkret olaraq dəfn edilmiş adamı təsvir edirdi və yalnız kişi heykəlləri idi. Qərbə (o cümlədən Qafqaza) doğru hərəkət etdikcə heykəllər getdikcə daha çox mərasimləşdirilmiş və ya qəhrəmanlaşdırılmış, abstrakt ulu baba, ilahiləşdirilmiş mifik əcdad haqqında təsəvvürlərlə getdikcə daha çox əlaqələndirilmişdir (71.82).

Heykəllər qarşısında icra edilən bu cür ayinlərin xarakterləri haqqında, heykəlin önündə müxtəlif heyvanların qurban kəsilməsi haqqında mövcud şəhadətlərə əsasən mühakimə yürütmək olar. Qurban kəsilmiş atın, öküzün, qoyunların, itin daş heykəl qarşısında aşkar edilmiş qalıqları buna sübutdur (67.191–192).

Qərbi türk çöllərində (qıpçaqlar) daş heykəllərə köçərilərin daha geniş kütləsi ehtiram edirdi. Fyodorov-Davıdovun fikrincə, bu adətdə əcdadların, lakin hamıya məlum olan, yaxınlarda ölmüş real insanın deyil, qəhrəmanlaşdırılmış və mifik ulu babanın mühüm komponenti qorunub saxlanılmışdır. Daha doğrusu, müəyyən dərəcədə daş heykəl qəbilə və tayfa kultunun – ulu baba kultunun geniş və daimi obyektinə çevrilir. Bunu böyük Azərbaycan şairi Nizami də daş heykələ sitayişin ümumi xarakteri haqqında danışarkən qeyd edir.

Qıpçaq çöllərinin qərb hissəsinə gəlib çıxmış bu daş heykəllərin uğradığı bədii metamorfoza məhz onların dəyişiklikləri ilə bağlıdır. Ölən adamın oxşarı öz yerini Tanrı obrazına verirdi. Buna müvafiq surətdə üzərində sifətin, əllərin və i.a. cizgiləri cızılmış yastı daş sütun bədii heykəl obrazı ilə əvəz olunmuşdur ki, həmin obrazda biz insanı sxematik işarələrdə deyil, ifadəli plastik formalarda təcəssüm etdirmək cəhdinin əlamətlərini tapırıq. Ölmüş adamın şərti "əvəzedicisi" daş heykəli idol nəslinə çevrilir ki, bu da öz mahiyyətinin ifadəsi üçün müəyyən bədii effekt və plastik vasitələr tələb edirdi.

Yəqin ki, ictimai idol, ictimai sitayiş əşyası funksiyasını daşıyan heykəllərdə simvolun – ölən adamın "əvəzedicisinin" konkret varlığı öz yerini bədii obraza verir ki, onun da başqa vəzifələri vardır – bunlar tamaşaçıya emosional-ideoloji təsir göstərməkdən ibarətdir. Bu vəzifəni sözün əsil mənasında güclü plastik vasitələr toplusu ilə yalnız incəsənət yerinə yetirə bilərdi.

Əcdadların kultu ilə bağlı olan abidələr arasında həmçinin arxeoloji və sənətşünaslıq ədəbiyyatında qeyri-dəqiq, amma ənənəvi olaraq "daş heykəllər" adı ilə məşhur olan daş abidələr xüsusi yer tutur. Məşhur türkoloqların səyləri sayəsində daş heykəllərin çoxsaylı müxtəlif ölçülü növləri indi bir neçə mədəni-xronoloji qrupa ayrılır. Bunlar tunc dövrünün heykəlləri, skiflər dövrünün heykəlləri, qədim yunan heykəlləri və cənubi rus çöllərində aşkar edilmiş qıpçaq heykəlləridir.

Qafqazın, Mərkəzi və Orta Asiyanın geniş dağ-çöl məkanlarında, habelə müasir Monqolustan, Tuva, Altay, Sintszyan (Çin), Qazaxıstan və Qırğızıstan ərazilərini ehtiva edən məkanlarda külli miqdarda yayılmış qədim türk heykəlləri (VI-IX əsrlər) ən iri qruplardan biridir.

Bu daş heykəllərin bir çoxu uzun müddət qəbirüstü heykəllər sayılırdı. Lakin xüsusi arxeoloji tədqiqatlar müəyyən etmişdir ki, kurqanlarda, yaxud qəbirlərdə dəfn edilmiş adamlarla onların üzərindəki daha gec tikililər sayılan heykəllər arasında birbaşa əlaqə yoxdur. Sübut edilmişdir ki, bu, türklərlə məskun olmuş çölə aid edilir; orada daş heykəllər yaratmaq adət idi. Heykəllər qəbirlərin üstündə deyil, onlardan uzaqda ucaldılırdı (68.91).

Cənubi Qafqazın erkən orta əsrə aid daş heykəlləri (Ağdam, Tərtər, Şamaxı), bir qayda olaraq, əlləri dua edən adamın pozasını almış ayaq üstə dayanan kişiləri təsvir edir. Yalnız bir, Şamaxıdakı heykəl sağ əlində qab tutmuş kişini təsvir edir.

Mərkəzi Asiyanın orta əsr heykəlləri, əsasən, enliyanaqlı üzü, çəpəki gözləri, çox vaxt bığı və saqqalı olan monqoloid sifətli əyləşmiş kişiləri təsvir edir. Ayrı-ayrı heykəllərdə qulaqlara taxılmış sırğalar, boyuna enmiş hamar saçlar və həmayillər təsvir olunmuşdur. Bir çox heykəllərdə paltar: müxtəlif tipli baş geyimləri, xalatlar və döşündə yaxalıqları olan ensiz, yaxud geniş manjetli qolları olan kaftanlar təsvir edilmişdir. Formaca müxtəlif olan toqqalara malik ensiz kəmərdən xəncər və qınına keçirilmiş qəmə, habelə çanta, itiləyici və digər əşyalar asılmışdır. Demək olar, bütün heykəllərin sağ əlində qab vardır, sol əl, bir qayda olaraq, kəmərin və ya silahın üstündə təsvir edilmişdir.

Ucsuz-bucaqsız çöllərdə aşkara çıxarılmış daş heykəllərin sayının çoxluğu onların geniş miqyasda istehsalının sahmana salındığına sübutdur. Bununla yanaşı, Orta Asiya heykəllərinin yarısından çoxu və demək olar, bütün Azərbaycan heykəlləri xüsusi olaraq seçilmiş daş bloklarda yapılmışdır. Bu heykəllər zahirən insan fiqurunun cizgilərini xatırladır. Bu cür antropomorf bloklar daha çox oxşarlıq üçün yonulurdu, onların kənarları yumrulaşdırılır və sonra cilalanırdı. Çox vaxt diyirlədilib gətirilmiş uzunsov formalı iri daşlardan istifadə olunurdu; bunu Abşeronda (Türkan kəndində) tapılmış heykəldən görmək olar.

Bir qayda olaraq, bu cür daşların hamar səthində yonma texnikası vasitəsilə fiqurun yalnız ən ümumi konturları həkk olunurdu. Görünür, emalatxanalar yox idi, amma indiyə kimi Qafqazda və Altayda təbiətin özünün külli miqdarda yaratdığı daş karxanalar vardır. Onlarca və hətta yüzlərlə karxanada daş bloklar və düzbucaqlı formalı plitələr atılıb qalmışdır. Məhz bunlardan, əsasən, heykəllərin hazırlanması üçün istifadə edilirdi.

Heykəlyapmanın texniki priyomları və bütövlükdə tətbiq olunan alətlər, ehtimal ki, Qafqaz, Altay, Tuva, Monqolustan və Semireçye ustalarında eyni idi, çünki daş heykəllər orta əsr köçərilərinin vahid dairəsinin abidələri idi. Bundan əlavə, bu kult xarakterli abidələr idi və həmin abidələrdə təkcə qədim türk heykəllərinin ikonoqrafik əlamətləri qanuniləşdirilməklə qalmayıb, əsas

texniki priyomlar da, konservativ priyomlar kimi, saxlanılırdı. Əgər Mərkəzi və Orta Asiyanın, habelə Cənubi Qafqazın bir-birindən uzaq müxtəlif regionlarından götürülmüş müxtəlif daş heykəlləri müqayisə etsək, bu kifayət qədər aydın görünər. Əcdadlara ehtiram edilməsinə həsr olunmuş mərasimlərdə bu idollardan istifadə olunması bir sarı mənbələrdə qeydə alınmışdır, onların arasında erkən orta əsrlərin sinxron mənbəyi – Kalankatlı Moiseyin “Ağvan tarixi” ən mötəbər hesab oluna bilər (50).

Asiyanın və Qafqazın geniş ənginliklərində əcdadların kultunu əks etdirən daş heykəllərin müqayisəli təhlili çöl mədəniyyəti daşıyıcılarının vahid ideoloji köklərə malik olduğunu göstərir. Bu heykəllərin semantik qohumluğu üslubi xüsusiyyətlərin inkişafı ilə müşayiət olunurdu ki, bunlarda da daş sütunlardan tutmuş zahiri görkəmin etnik tiplərini əks etdirən antropomorf sifətlərədək meydana gəlmiş etnomədəni cizgilər əks olunmuşdur.

## *DƏFN MƏRASİMLƏRİNİN HEYKƏLTƏRAŞLIĞI*

Ənənəvi mədəniyyətlərdə ayin (kult praktikası) dünyanın ekzistensial qavranışının praktik realizə edilməsinin formasıdır, o, bu dünyaqavrayışının fenomenal reallıqda təcəssüm etdirilməsi sahəsində insan fəaliyyətinin əsas formasıdır. Bununla bərabər, kult praktikası ənənəvi mədəniyyət sisteminin fəaliyyət göstərməsində əsas rol oynayır, çünki onda ziddiyyətlərin insan tərəfindən dərk edilməsi üçün son həddin simvolik aradan qaldırılması ifadə edilir. Yalnız mərasimdə varlığın tamlığının və onun haqqında biliyin bütövlüyünün dərk edilməsi mümkün olur. Bu isə bir nemət kimi başa düşülür və həmin nemətin daşıyıcısı kimi mərasimi ideyaya istiqamətlənir. Onun bütün intensivliyinə xas olan bu hiss-həyəcan insana xüsusi həyati dolğunluğu ilə məlum universumda özünün kök salmasını duymağa, müəyyən qaydada idarə olunan qanunauyğun sferaya cəlb olunmasını dərk etməyə imkan verir (64.17). P.A.Florenskinin fikrincə, əzəldən insanın bütün fəaliyyəti məna ilə aşılanmış, ayini xarakter daşımışdır (müəllifin terminologiyasında “feurgik”). İnsan fəaliyyətinin birliyi pozulmağa başladığı vaxt feurgiya yalnız ayini hərəkətlərədək yığcamlaşdı. “Məhz o vaxt fəaliyyətlər Reallıqdan və Mənadan reallıqlara və mənalara üz çevirdi... Hər şey həqiqətə oxşayaraq, Həqiqətlə bilavasitə əlaqəsi olmadı, Həqiqət kimi və Həqiqətdə daha mövcud olmadı. Qısasını desək, hər şey dünyəvi oldu...” (64.55). Ayin insan fəaliyyətinin ilkin, əsas, ontoloji baxımdan ən dolğun formasıdır. A.K.Bayburinin əsərlərində inandırıcı surətdə göstərildiyi kimi, “belə güman etməyə hər cür əsas vardır ki, texnologiya ayini hərəkətlərlə müşayiət edilməmiş, əksinə, məhz ayin texnologiyanı yaratmışdır” (23.68).

Qədim insanların və erkən orta əsr türk tayfalarının dəfnetmə adətlərinin xarakteri haqqında bəzən bir-birinə zidd olan çoxlu miqdarda xatırlatmalar vardır.

Türk dəfnetmə adətləri haqqında ən erkən yazılı dəlilləri bizə çinlilər vermişlər. Çinlilərin "Tanşu xronikası"nda qədim türk dəfnetmə ayini belə təsvir olunur: "Qəbrin yanında tikilmiş binada mərhumun şəkli çəkilmiş surətini və sağlığında onun iştirak etdiyi vuruşmaların təsviri qoyurlar. Adətən, o, bir adamı öldürmüşdürsə, bir daş qoyurlar. Bəzilərində bu cür daşların sayı yüzə və hətta minə çatır" (26.179).

Bir sıra arxeoloqların çoxillik zəhməti sayəsində qədim türk dəfnetmə ayinlərinin izləri tapılmışdır; onların başdaşı yazıları da aşkar edilmişdir. Bu yazıların məzmununu Çin mənbələri bütünlüklə təsdiq etmişdir. İndi biz kifayət qədər yaxşı bilirik ki, Orxon türklərinin qəbirlərinin yanındakı daş sıraları nə deməkdir. Bu daşlar qaba şəkildə yonulmuşdur, çox vaxt isə sadə daşlardan ibarətdir. Bu balballar öldürülmüş düşmənlərin təsvirləridir. Yaxşı yonulmuş daş heykəllər isə ölən adamı, onun qohumlarını və ya sadəcə olaraq yaxın adamlarını təsvir edirdi.



*10. Daş heykəl.*
*Ağdam. Alban dövrü.*

Balballar və daş heykəllər, Monqolustandan başqa, Altayda, Tuvada və Qazaxıstanda, Qafqazda da məşhurdur (33.86). Burada onlar kult yerləri olan daş hasarlarla bağlıdır. Hasarın şərq divarı yanında üzünü şərqə çevirmiş daş heykəl dayanır; bəzən, Orxon türklərində olduğu kimi, sadə daşların – balballarын sıraları hasarlardan şərqə doğru uzanıb gedir. Eyni zamanda ölənlərin heykəltəraşlıq portretlərindən ibarət olan daş heykəllər diqqətlə və ustalıqla yonulmuşdur. Hasarların daxilində dəfn olunmuş insanın hətta izlərinə belə bir dəfə də olsun rast gəlinməmişdir. Yalnız üstünə torpaq, kömür, kül tökülüb iri daşlarla doldurulmuş dəyirmi çalalar tapırdılar, çalanın dibinə yaxın isə çürük ağac qalıqlarına rast gəlinirdi. Çalalarda həmçinin heyvanların sümüklərini tapırdılar. Hasarların bütün sahəsində də eyni şeylərə rast gəlinirdi. "Tanşu"da xatırladıldığına görə, ölmüş türklərin qəbirləri yanında tikilmiş binalar kimi, bu cür hasarlar da ölənlərin anıldığı yer idi. Həmin binalarda tapılan sümüklər, şeylər, kül və başqa əşyalar xatirə şeylərinin qalıqları idi. Hasarların yanında, eyni zamanda, VII-IX əsrlərdə yaşamış türklərin dəfn olunduğu kurqanlar da tapılır.

Bir tərəfdən, Orxonda, Altayda, Tuvada və Qazaxıstanda qədim türklər, digər tərəfdən, X-XIV əsrlərdə Şərqi Avropada yaşamış türkdilli qəbilələr arasında çox uzun tarixi bir dövr vardır. Təbiidir ki, bu müddət ərzində qədim türk ayini müəyyən dəyişikliklərə uğramış, lakin, hər halda, başlıca əlamətləri qalmışdır. Bu, xüsusən, qıpçaqlara aiddir. Qıpçaqların mürəkkəb dəfnetmə kompleksi qədim türklərdə olmuş bu cür komplekslərə bənzəyir.

X-XIV əsrlərdə yaşamış türk qəbilələrinin dəfnetmə adətlərinin xarakteristikası üçün ibn Fədlanın, Q.Rubrukun, Plano Karpininin və digər müasirlərin əsərləri çoxlu material verir. Onlar bəzi hissələrdə qədim türklərdə dəfnetmə adətlərinin təsvirini tamamlayır və dəqiqləşdirirlər.

Rubruk tatar-monqol və türk qəbilələrinin dillərini bilməsə də, onların arasında çox maraqlı etnoqrafik müşahidələr apara bilmişdir. Tədqiqatçı onların müxtəlif etnik xarakteristikalarını verir.

Karakoruma gedərkən öz yolu üstündə gördüyü komanların dəfnetmə ayininin, onların qəbir-kurqanlarının, daş heykəllərinin və digər yerüstü tikililərinin təsviri maraq doğurur: “Komanlar ölmüş insanın üzərində kiçik təpə düzəldir, ona üzü şərqə çevrilmiş və əlində göbəyi qarşısında kasa tutmuş heykəl ucaldırlar. Onlar həmçinin varlılar üçün ehramlar tikir, yəni şişuclu evciklər inşa edirlər və bəzi yerlərdə mən kərpicdən tikilmiş böyük qüllələr, müəyyən yerlərdə isə daş evlər gördüm, hərçənd orada daş tapılmır. Mən bu yaxınlarda ölmüş bir adamın dəfnini gördüm, onun yanında hündür şüyüllərdə dünyanın hər bir tərəfindən 4 ədəd olmaqla 16 at dərisi asmış və ölənin qarşısında içmək üçün qımız, yemək üçün ət qoymuşdular, hərçənd onun haqqında deyirdilər ki, o, xristian olmuşdur. Mən şərq istiqamətində digər qəbirlər də, yəni daş döşənmiş böyük meydanlar gördüm, bunların bəziləri dəyirmi, digərləri dördbucaqlı idi: sonra isə dünyanın 4 tərəfindən meydanın hər bir tərəfinə dörd uzunsov daş qoyulmuşdu” (16.102–103). Arxaik ayin (heç olmasa, məlum ənənə üçün əsas ayin) kollektivin bütün üzvlərinin iştirakını nəzərdə tutur, həm də tamaşaçıları da, iştirakçıları da nəzərə alır. Çöl Cənubi Qafqazın meqalitik abidələrinə tənha menhirlər, xiyabanlar və menhir kompleksləri aiddir. Son illərdə görülmüş işlər nəticəsində arxeoloqlar məlum tipli otuzdan çox abidə aşkar edə bilmişlər.

Bir qayda olaraq, onlar bilavasitə yaşayış məskənlərinin yaxınlığında, az-az hallarda isə son tunc dövrünə məxsus məzarlıqların yanında yerləşmişdir.

Çöl Qafqazın tənha menhirləri çaybasarlar üzərindəki terrasların arxa tikişi yanında, yaxud da əsas sahilin hündürlüyünün aşağı hissəsində yerləşir. Menhir komplekslərinin əksəriyyəti də belə bir mövqe tutur. Menhirlərin xiyabanları bir çox hallarda topoqrafik cəhətdən xeyli hündürdə, təpələrin yamaclarında yerləşir. Tənha menhirlərin və onların komplekslərinin böyük əksəriyyəti son tunc dövrünün yaşayış məskənlərinin bilavasitə yaxınlığında qoyulmuşdur.

Menhirdən ən yaxın yaşayış çökəklərinədək məsafə əksər hallarda 40 metrdən 80 metrə qədərdir. Tənha menhirin yaxınlığında müasir səthin qeydə

alınmış maksimum hündürlüyü standart topoqrafik mövqe nəzərə alınmaqla 1,9 metr, maksimum ümumi hündürlük isə 3,15 metrdir.

Menhirlərin xiyabanları həmişə kiçik mailliklə qərb-şərq istiqamətində uzanıb gedir və şaquli vəziyyətdə qoyulmuş daşların bir cərgəsindən ibarətdir, onların əksəriyyəti hazırda yerə yıxılmış, ya da sındırılmışdır. Buna görə də xiyabanın strukturunun onun qazıntılarından sonra yalnız yenidən rekonstruksiya edilməsi mümkündür. Tənha menhirlərin əksəriyyətinin yer səthi üzərində hündürlüyü təqribən 1 metrdir. Xiyabanlarda menhirlərin yer səthi üzərində hündürlüyünün 1,5 metrədək olduğu qeydə alınır. Menhirlərin xiyabanlarının çöl ruhlarına ehtiram kultu ilə bağlı olduğunu güman etmək olar. Bu təfsirin xeyrinə birbaşa görünmə zonasında menhirlərin xiyabanlarının yerləşməsi, onların bir qayda olaraq, ətrafın ən çox nəzərə çarpan zirvəsindən cənuba doğru uzanıb getdiyinə dəlalət edir.

Tənha menhirlər və menhir kompleksləri son tunc dövründə çöllərin Hind-Avropa əhalisi tərəfindən uzunmüddətli qəsəbələrlə bir cərgədə qurulurdu. Bütün hallarda onlar yaşayış yerlərindən bir qədər uzaqda və hipsonometrik baxımdan bir qədər hündürdə ucaldılırdı. Menhir çöl ilə insan məskəninin meydançası arasında sərhəd əlaməti idi. Həmin abidələrin topoqrafik təhlili göstərir ki, onların hamısı yaşayış məskəninə yaxınlaşmaq üçün ən əlverişli istiqamətlərdə qoyulmuşdur. Bu, belə güman etməyə imkan verir ki, menhirlər yaşayış məskənlərinə aparan yolların kənarında qoyulurdu. Onların bu cür yerləşməsi özünü daha çox doğruldur, çünki məhz yol qəsəbə ilə ətraf məkan arasında əlaqələndirici elementdir, o, sərhəd nişanı ilə göstərilməlidir. Menhirin simvolikası mənimsənilmiş və mənimsənilməmiş məkanların bir-birinə qarşı qoyulmasını əhatə edən binar simvolika kimi təfsir oluna bilər. Çöl tərəfdən qəsəbədən bir qədər hündürdə yerləşmiş və uzaqdan görünən menhir insan mənzilinin simvolu, antropogen məkanın başlanğıcının əlaməti kimi ucalırdı. Bu daşlarda emal izlərinin olmaması, yəqin ki, menhirlərin simvolikasının məhz kortəbii aspektilə izah edilir. Qəsəbə tərəfdən isə menhir, onun arxasında çöllərin açılan mənzərəsi əlaməti kimi görünürdü. Menhirin insan mənzili və onu əhatə edən dünya arasındakı sərhəddə yerləşməsi

*11. Daş heykəl. Xınıslı, Şamaxı, III-V əsrlər.*



bizi onun sərhədi qapayan və mənzili qoruyan keşikçi kimi qavramağa vadar edir. Sərhədin keşikçisi məhz dünyalar arasında əlaqənin rəmzi olan yolun kənarında dayanmalıdır.

Bununla əlaqədar olaraq, bütpərəst əcdadlarımızın məskunlaşdıqları yerlərdə tapılmış və Qara dənizdən tutmuş Altay çöllərinədək yayılmış türk balbalları adlanan heykəltaraşlıq nümunələrinin təsviri problemi maraq doğurur.

Əvvələn, etiraf etmək lazımdır ki, daş sütuncuqların (hasarların) sıraları qədim türklərin, demək olar, bütün anılma tikililərinin ayrılmaz detalıdır və türk balballarıməşhurdur. Bütün qədim türk dünyasında geniş şöhrət qazanmış bu balballar indiyədək elmi mübahisələrin mövzusu olaraq qalır, hərçənd “balbal” termininin özünü (ata, əcdad mənası verən qədim türk “baba” sözünün təhrif olunmuş şəkli) izahı haqqında bərqərar olmuş fikri bu məsələdə əhəmiyyətli irəliləyiş hesab etmək olar.

Məşhur arxeoloqlar L.R.Kızlasovun, Y.A.Şerin və S.Q.Klyaştornının son araşdırmaları nəticəsində uzun sürən belə bir diskussiyaya yekun vurulmuşdur ki, balbal dedikdə nə başa düşmək lazımdır. Məlum olduğu kimi, əvvəllər elmi ədəbiyyatda daş heykəllərin özünü də belə adlandırırdılar. Hazırda bu ad yalnız anılma tikililərindən şərqə uzanıb gedən daş sütuncuqların sıralarına məxsusdur. Bütün əvvəlki tədqiqatçılar (Herodotdan başlayaraq) belə bir fikirdə yekdildirlər ki, türklər öz döyüşçülərinin anılma tikililəri yanında dəfn olunmuşun özünün öldürdüyü düşmənlərin sayı qədər daş sütuncuqlar – balballar qoyurdular. Belə bir nəticə türk (“tuku”) dəfn ayinlərini təsvir edən Çin rəsmi xronikalarının məlumatlarına da əsaslanır: “Adəti üzrə, əgər o bir nəfəri öldürmüşdürsə, onda bir daş qoyurlar, onlarda bu cür daşların sayı yüzə və hətta minə çatır”. Həqiqətən, qədim türk anılma qurğularının sıralarında onlarca, bəzən də minlərlə balbal olurdu (42.206–209).

Qədim Türk aristokratiyasının, demək olar, bütün anılma komplekslərinin yanında çoxlu miqdarda balbalın qoyulması bir çox tədqiqatçılarda, təbii olaraq, təəccüb doğurur. Təsəvvür etmək çətindir ki, türk xaqanları, yaxud onların sərkərdələri sağlıqlarında yüzlərlə düşmən döyüşçüsünü öldürə bilmişlər. Altayda da minlərlə hasarın yanında həmişə balbal sıraları vardır. İstəristəməz belə bir sualla qarşılaşırsan: doğrudanmı onların hamısı yalnız türk döyüşçülərin şərəfinə inşa edilmişdir? Bizə belə gəlir ki, balballarınqoyulması adətinin izah olunmasına təkcə yazılı mənbələr deyil, daha artıq dərəcədə faktik arxeoloji material da cəlb etmək lazımdır. Altayda, lap elə bütün türk məkanında da daşların cərgələrə qoyulması ənənəsinin özü çox qədimdir. Nadir yeknəsəqliyi ilə fərqlənən bu sadə memarlıq mövzusu zamanca və təyinatına görə müxtəlif olan bir çox kult qurğularında təcəssüm etdirilmişdir. Həmçinin erkən köçərilərin bir çox çöl kurqanlarının şərq tərəfində qoyulmuş daş stellaların sıraları mənasına və ehtimal ki, təyinatına görə daha çox yaxındır. Bu dövrün bütpərəst məzarlıqlarının səciyyəvi xüsusiyyəti şimaldan cənuba istiqamətlənmiş, necə deyərlər, kurqan zəncirələridir. Qədim türk dövrünün

bütpərəstlik hasarlarının bütöv qruplarının qurulması zamanı planlaşdırmanın və səmtləndirmənin tamamilə eyni prinsipinə riayət edilmişdir. Erkən köçərilərin kurqanları kimi, onlar da kiçik mövsümi qəsəbələrdə mənzillərin yerləşdirilməsi qaydasını təqlid edirdilər ki, bu da məkanda abidələrin oriyentasiyalarında xüsusi ilə təzahür edir. Dəfələrlə dəfnlər və xeyratlar üçün nəzərdə tutulmuş xüsusi ərazi kimi, bu cür dəfn-xeyrat kompekslərinin meydana gəlməsi etnik birliyin, ailə qohumluğunun və axirət dünyasında var olmaqda davam etmək ideyasının parlaq ifadəsidir.

Erkən köçərilərin kurqanların yanındakı balballarının təyinatı məlum deyil. Lakin tanınmış arxeoloq S.İ.Rudenkonun söylədiyi belə bir fikir diqqətəlayiqdir. O belə hesab edirdi ki, qəbirlərin yanında qoyulmuş daşların sayı dəfn mənasimlərində və xeyratlarda iştirak etmiş şəxslərin, yaxud qohumların sayına bilavasitə müvafiqdir. Bu fikri inkişaf etdirərək, o güman edirdi ki, balballların sıraları qadınların və uşaqların qəbirlərinin yanında da ola bilərdi, buna görə də onları öldürülmüş düşmənlərin sayı ilə əlaqələndirmək olmaz. Axırıncı nəticə son illərin tədqiqatları ilə təsdiq edilmişdir. Altay və digər çöl kurqanları yanındakı skif balballarının təyinatı bəs nə idi? Biz onları köçərinin istənilən mənzilinin ayrılmaz hissəsi olan rəmzi atbağlanan dirəklər hesab etmək fikrindəyik. Herodotun məlumatı da qəbirlərin yanında atbağlanan dirəklərin qoyulması adətinin son dərəcə qədimliyinə dəlalət edir. Arxeoloji qazıntılar bu məlumatları bütünlüklə təsdiq etmişdir. Kubanda Yelizavetinski və Ulski kurqanlarının tədqiqatları zamanı çoxsaylı atbağlanan dirəklərin qalıqları aşkar edilmişdir. Azərbaycanın çöl zonasında da eyni balballar tapılmışdır.

Altayda atbağlanan dirəklər funksiyasını, görünür, balballar adlanan elə bu cür daş dirəklər yerinə yetirirmiş. Bizim ehtimalımız Altay kurqanları və hasarları yanında balballaların yerləşməsini köçərilərin real mənzili yanında da atbağlanan dirəklərin yerləşməsi qaydasına heyrətamiz oxşarlığına əsaslanır. Bir sıra atbağlanan dirəkləri adətən köçərinin mənzili yanında bir qədər kənarda şərqə və cənuba istiqamətlənmiş vəziyyətdə yerləşdirirdilər. Bu eynilə balballarların qoyulmasında da müşahidə olunur. Yakutlarda birinci dirək fəxri qonağın atı

*12. Daş balbal. Abşeron, Türkan, tunc dövrü.*



üçün nəzərdə tutulurdu və başlıca dirək (toyon serge – “cənab dirək”); ikinci dirək orta gəlirli qonaq üçün nəzərdə tutulurdu (ort serge – “orta dirək”); üçüncü dirək daha yoxsul şəxs (kelin serge – “apxa dirək”) üçün nəzərdə tutulurdu; ən uzaq dirəyi “etax serge adlandırırdılar. Skiflər dövrünün bir çox Altay kurqanları yanında, habelə qədim türk hasarları yanında yaxınlıqdakı bir və ya iki-üç daş da, bir qayda olaraq, öz iri ölçüləri ilə qalanları arasında fərqlənirdi. Varlı yakutlar bəzən doqquza qədər atbağlanan dirəyi sıraya düzürdülər. Beləliklə daha varlı köçərilər bir neçə atbağlanan dirək qoyurdular, yoxsullar çox vaxt bir atbağlanan dirəklə kifayətlənirdilər. Bu cür sosial fərqlənmə qədim dəfnetmə-anılma qurğularının konstruksiyalarında da, onlardakı balbalların sayında da izlənilə bilər. Qədim Altay zadəganlarının ölçüsünə görə nəhəng kurqanları yanında da balbalların – atbağlanan dirəklərin sayı sıravi köçərilərin kiçik kurqanları yanında qoyulmuş elə bu cür balbalların sayından qat-qat artıqdır. Əgər zadəganların anılma məbədlərinin və adi hasarların yanındakı balbalları müqayisə etsək, oxşar mənzərənin şahidi olarıq. Təsadüfi deyildir ki, bir çox köçəri xalqlarda atbağlanan dirəklərin adı uyğun gəlir. Yakutlarda, buryatlarda və monqollarda onların ümumi adı vardır: serge. Bizim üçün “serge” sözünün ikinci mənası (yakutca serge – “sıra”; buryatca serge – “sıra” ; azərbaycanca cərgə –”sıra”; monqolca erge – “sıra, qayda”; türkcə arqa – “dairə, sıra”) daha maraqlıdır və şübhəsiz öz kökləri ilə qədim türk dövrünə gedib çıxır.

Beləliklə, balballarıdəfnetmə-anılma mərasimində iştirak edən qohumların və qonaqların minib gəldikləri atlar üçün nəzərdə tutulan atbağlanan dirəklər hesab etmək olar. Görünür, atbağlanan dirək həm də daha artıq dərəcədə müəyyən adamın ölənin xatirə xeyratında iştirakının (ona diqqətin) bir növ əlaməti idi. Zənnimizcə, qədim türk xaqanlarının anılma məbədləri yanında qoyulmuş balballarda aşkar edilmiş şəxsi möhürlərini və yazı-avtoqraflarını bununla izah etmək olar. Başqa sözlə desək, dəfnetmə-anılma mərasiminin hər bir iştirakçısı öz balbalını məbədin qarşısında saxlayırdı ki, ölənin ruhu onu digər bu cür diqqət əlamətləri sırasında görə bilsin (43.46–52).

Tədqiqatçıların xeyli hissəsi böyük faktik material əsasında belə bir nəticəyə gəlmişdir ki, xeyratla – ölənin ruhunun yedirdilməsi və başqa aləmə, axirət dünyasına yola salınması ilə bağlı olan ayinlərin icra edildiyi qədim türk hasarları qurbankəsmə xarakteri daşıyırdı (41.162–187). Azərbaycan çöllərində aşkar edilmiş daş hasarlar iki əsas tipdən – həm dəyirmi, həm də kvadrat formalı tiplərdən ibarətdir. Dəyirmi hasarlar genetik baxımdan öz kökləri ilə Abşeronda və Mil düzündə geniş yayılmış kurqan mədəniyyətinə gedib çıxır. Kvadratşəkilli hasarlar isə “daş yeşik” tipli qəbir qurğuları ilə bağlıdır ki, o da Azərbaycan ərazisində geniş yayılmışdır.

Balballarınplastik xarakteristikaları əzəldən rüşeym vəziyyətində olmuş, ideoloji cəhətdən anılma mərasiminin mahiyyətini əks etdirmişdir. Onlarda heykəltəraşlıq ideyası implisit (daxildə) halda ifadə edilərək, eksplisit (xaricdə) ifadə edilmiş antropomorf plastik modelləşdirmə səviyyəsinə çatmamışdır.

## *TOTEMİSTİK AYİNLƏR VƏ ONLARIN HEYKƏLTƏRAŞLIQDA İNİKASI.*

Totemik inanclar, yaxud totemizm ona inamdır ki, heyvanların, bitkilərin müəyyən növləri, bəzi maddi predmetlər, habelə təbiət hadisələri əcdaddır, soydur, konkret soy kollektivlərinin hamisidir. Nəslin bəzi heyvanlarla əzəli mistik əlaqəsi bütün türk xalqları və əlbəttə, azərbaycanlıların bütpərəst əcdadları arasında sərf-nəzər edilmişdir. Bu cür inanclar elmdə totemizm adlandırılmışdır; Şimali Amerika hindilərinin qəbilələrindən birinin dilindən götürülmüş “totem”, “o-totem” – “onun nəsli” sözlərindən yaranmışdır.

Totemik heyvanlar və bitkilər real və maddi predmetlər və inancların fantastik elementi burada, guya, məlum heyvanla (bitki ilə) insan arasında mövcud olan qohumluq, habelə insanın öz totemi ilə qarşılıqlı magik əlaqəsinə inam haqqında təsəvvürdən ibarətdir. Lakin totem heç də totemik inancların yeganə obyekti deyildir. Totemik əcdadlara və onlar haqqında miflərə inamın çox mühüm ideoloji rolu bundan ibarətdir ki, onlarda, elə bil, nəsil icmasının ərazi ilə əlaqəsi təcəssüm etmişdir. Totemik əcdadlar haqqında miflər coğrafi landşaftın ayrı-ayrı hissələrinə bağlıdır. Totemik əcdadlar həmçinin mədəni “qəhrəmanlar” funksiyalarını yerinə yetirirlər. Totemizmin izləri və qalıqları müasir dinlərdə müxtəlif dərəcədə üzə çıxır və bir çox xalqların etnik mədəniyyətlərində elementlər kimi qorunub saxlanılmışdır.

*13. Terrakota öküz fiqurcuğu. Kültəpə, eneolit.*




Dinşünasların əksəriyyəti totemizmi istər onun xeyli dərəcədə bəsitliyinə, istərsə də o, demək olar, bütün türk xalqlarının dini təsəvvürlərinin əsasını təşkil etdiyinə görə dinin ən erkən formalarından biri kimi sərf-nəzər etməyə maildir. Son dərəcə bənzərsiz iki əsər – Z.Freydin “Totem və tabu” (1912-ci il) elmi işi, E.Dürkheymin və M.Mossun dinşünaslıqda sosioloji yanaşmanın klassik nümunəsi olan “Təsnifatın bəzi ibtidai formaları



*14. Terrakota öküz fiqurcuğu. Göytəpə, Cənubi Azərbaycan, eneolit.*



*15. Tunc maral fiqurcuğu. Mingəçevir, e.ə. II minillik.*

haqqında: kollektiv təsəvvürlərin öyrənilməsinə dair" (1903-cü il), tədqiqatı sayəsində dinşünaslıqda, kulturologiyada və sənətşünaslıqda totemizm olduqca məşhurdur.

Adətən totemizm dedikdə insanlar qrupu (məsələn, qəbilə qrupu) və heyvanların, yaxud bitkilərin (bəzən cansız predmetlərin – dağların, çayların, dənizlərin və i.a) müəyyən növü arasında kollektiv qohumluq olduğunu nəzərdə tutan təsəvvürlər başa düşülür.

Totem (məsələn, totemlik heyvan) məlum qrupun əcdadı və sitayiş obyekti kimi sərf-nəzər edilir. Bir qayda olaraq, totemi öldürmək və ondan qida kimi istifadə etmək qadağan olunur, hərçənd ayrı-ayrı ayinlər, əksinə, totemin öldürülməsini və onun kult kimi yeyilməsini nəzərdə tutur, guya, bu, totemə təkrar qovuşmaq vasitəsilə qohumluq əlaqələrini möhkəmləndirir. Kulturologiyada sosioloji məktəb hesab edir ki, dini ideyalar (xüsusən, erkən cəmiyyətlərdə) cəmiyyətin təşkili məqsədini (onun qruplara və ya siniflərə bölünməsinin ideyalar sahəsində proyeksiyası salınır) qarşıya qoyur, totemizmi ayrı-ayrı qruplara bölünmüş cəmiyyətin arxaik strukturunun proyeksiyası kimi sərf-nəzər etməyə maildir. Bu qrupların isə kökləri totem əcdadlara (totem qruplarına) gedib çıxır. Lakin M.Eliadenin haqlı olaraq göstərdiyi (74.200) kimi, cəmiyyətin və Kainatın strukturları arasında paralelizmin olması əslində yalnız mifoloji (arxaik) təfəkkürə immanent olan strukturlaşmanın vahid prinsipinin mövcud olduğuna dəlalət edir və heç



*16. Tunc quş heykəlcikləri. Mingəçevir, e.ə. II minillik.*

də bu strukturlaşmanın sosial şərtiliyinə işarə vurmur. Bundan başqa, elmə eyni xalqlarda təsnifatların totemli və digər daha “rasional” formaların mövcud olması faktları da məlumdur. Lakin istənilən halda totem, hər necə olsa, təsnifat sıralarının markeri kimi çıxış edir və onların vasitəsilə arxaik adam öz təcrübəsinin məzmununu qaydaya salır. Bu arxaik təsnifatlaşdırmada bəsit cəmiyyətlərlə birlikdə izsiz ölüb getmiş, lakin dünya sivilizasiyası tarixində özünü olduqca incə formalarda göstərmişdir. Mahiyyət etibarilə, nüfuzlu çinşünasların fikrincə, bütün klassik Çin fəlsəfəsinin metodoloji əsasını təşkil edən həmin təsnifatlaşdırma və



*17. Tunc maral heykəlcikləri. Dolanlar, Qarabağ, e.ə. I minillik.*



*18. Tunc şir fiqurcuğu. Həsənlu, Cənubi Azərbaycan, e.ə. IX-VIII əsrlər.*

nömrələşdirmə, şübhəsiz, strukturun totemik sahmana salanmasının malik olduğu eyni təbiətə malikdir. Məsələn, Çin kosmologiyasının ilk ünsürləri (u sin) olduqca uzun təsnifatlaşdırıcı sıraları markalayaraq və ya kodlayaraq, Çin mədəniyyətinin universumunu harmonik surətdə sahmanlayır (38.172). Totemizm həmçinin olduqca maraqlı ayinləri özündə ehtiva edir ki, bunlar da (artıq xatırladıldığı kimi, totemin ətinin ayini xarakterli yeyilməsindən əlavə), məsələn, iştirakçıların totem heyvanları, yaxud bitkiləri ilə eyniləşdirilməsini nəzərdə tutur.

Azərbaycanlıların folklorunun və xalq mərasimlərinin tədqiqatları sübut edir ki, eneolit dövründən (e.ə. 4–3-cü minilliklər) başlayaraq əcdadlarımızın



*19. Terrakot şir fiqurcuğu. Mingəçevir, Alban dövrü.*

mərasimlər praktikasında totemin kult ayinlərinə riayət olunmuşdur. Ayinlərin keçirilməsi üçün hazırlanmış ən erkən heyvan fiqurcuqları da buna dəlalət edir.

Tunc dövrünün (e.ə. 3–2-ci minilliklər) heykəltəraşlıq fiqurcuqlarında bu kultlar daha geniş əks olunmuşdur. Qəbilə quruluşunun əmələ gəlməsi, böyük qəbilələrdən tayfaların ayrılması müxtəlif tayfa kultlarının formalaşması ilə müşayiət olunurdu. Əzəl mərhələdə bu totemlər "öz-özgə" prinsipi üzrə tayfa daxilində eyniləşdirici rolunu yerinə yetirirdi. Sonralar inkişaf edən və yeni funksiyalar kəsb edən totemlər qəbilənin və ya tayfanın dini müdafiəçisi rolunu yerinə yetirməyə başlayır.

Totemə ehtiram mərasimləri əsas kultlardan birinə çevrilir və totemlərin müqəvvalarının, sonralar isə onların heykəltəraşlıq əvəzedicilərinin hazırlanması ilə müşayiət edilirdi.

Azərbaycanda totemik kultların geniş yayılması silahda və məişət müxəlləfatında (keramika, kəmərlər, bəzək əşyaları, tilsimbəndlər və i.a.) totemik heyvanların çoxsaylı təsvirlərində əks olunmuşdur. Lakin totemik kultların ən maraqlı fenomeni gildən, daşdan, metaldan və keramikadan totemlərin heykəltəraşlıq fiqurlarının hazırlanması idi.

Maralların, öküzlərin, quşların və digər heyvanların Naxçıvanda, Mingəçevirdə, Xanlarda və digər yerlərdə aşkar olunmuş tunc fiqurcuqları hələ orta tunc



*20. Tunc şir heykəlciyi. Boradigah, Masallı, I əsr.*



*21. Şir başı şəklində tunc fiqur. Həsənlu, eramızın IX əsri.*



*22. Dağ keçisinin tunc fiquru. Cənubi Azərbaycan, e.ə. II minillik.*



*23. Qızıl qartal heykəli.*
*Xınıslı, Şamaxı,*
*e.ə. I əsr – eramızın I əsri.*

dövründə (e.ə. 2-ci minillik) Azərbaycan ərazisində totemik kultların geniş yayıldığına dəlalət edir.

Dəmir dövründə də (e.ə. 1-ci minillik) bu kultun yayılmasının çoxlu sübutu istər Şimali Azərbaycanda (Qarabağ, İsmayıllı rayonu), istərsə də Cənubi Azərbaycanda (Həsənli) aşkar edilmişdir.

Totemizmlə bağlı olan zoomorf plastikanın həqiqətən külli miqdarda olması Albaniya dövrünə (e.ə. 4-cü əsr – eramızın 7-ci əsri) aiddir. İsmayıllıda, Masallı rayonunda, Qubada və digər yerlərdə arxeoloji tapıntılar hətta erkən orta əsrlərdə bu kultun mövcudluğuna işarədir.

Bu heykəllərin böyük əksəriyyəti kult xarakteri daşıyır və tayfanın, qəbilənin, yaxud da ayrıca ailənin totem müdafiəsini təmin edən müxtəlif tote-



*24. Tunc göyərçin fiqurcuğu. Daşkəsən, Alban dövrü.*

mik ayinlərin yerinə yetirilməsinə xidmət edirdi. Bu cür fiqurcuqların əksəriyyəti yaşayış məskənlərinin mədəni təbəqələrində tapılmışdır.

Totemlərin heykəltəraşlıq və relyef təsvirlərinin bundan az olmayan miqdarda ikinci qrupu müxtəlif bəzək əşyalarında və şəxsi tilsimbəndlərdə vardır. Bir qayda olaraq, onlar kiçikölçülüdür, incə üslubi formada hazırlanmışdır. Bu cür məmulatlarda bəzən totemik heyvanın bütün fiquru onun bədəninin bir hissəsi (buynuzlar, dırnaq, caynaq, qanad, baş və i.a.) ilə əvəz edilmişdir.

Xınıslı kəndindən (Şamaxı rayonu) qartal fiquru (4 sm), Xaçbulaqdan bürünc sancağın təpəsində dağkeçisinin fiquru, Mingəçevirdən sancaqların təpələrində, quşların fiqurları, Qarabağdan bürünc sancağın təpəsində öküz başı, Yedditəpədən (Füzuli rayonu) dağkeçilərinin və öküzlərin fiqurcuqları şəklində sinəbənd və başqa əşyalar bu cür məmulata aiddir.

Deməklazımdır ki, minilliklər ərzində totemlərin kultu hətta orta əsrlərdə monoteist İslam dininin yayıldığı bir vaxtda heç də bütünlüklə aradan qalxmamışdır. İslam dininin bütpərəstlik qalıqları ilə çoxəsrlik mübarizəsi totemik heyvanı ilə dini mahiyyət daşıyan əlaqəyə və bu totemin xüsusi müdafiəsinə inamı dini-mifik şüurdan və təhtəlşüurdan axıradək sıxışdırıb çıxara bilmədi. Qaraqoyunlu və Ağqoyunlu tayfalarının bayraqlarında heyvanların təsvirləri və heykəllərin şəkilləri Bakı qalasının (Qoşaqala qapısı) darvazalarında, məişət müxəlləfatının predmetlərində və sairdə şirlərin və öküz başlarının təsvirləri buna parlaq sübutdur.

Totemik əcdadlara və onlar haqqında miflərə inamın çox mühüm ideoloji rolu bundadır ki, onlarda, elə bil, qəbilə icmasının yaşayış yerinin ərazisi ilə əlaqəsi təcəssüm edirdi. Bunun nəticəsində totemik əcdadlar haqqında miflər bəzən coğrafi landşaftın ayrı-ayrı hissələrinə bağlanırdı ki, bu da Azərbaycan toponimikasında da əks olunmuşdur.

# II FƏSİL

## QƏDİM VƏ ERKƏN ORTA ƏSR HEYKƏLTƏRAŞLIĞININ TİPOLOGİYASI

### *MONUMENTAL HEYKƏLTƏRAŞLIQ*

Azərbaycanda onun tarixinin qədim dövründə və erkən orta əsrlərdə klassik incəsənətin və monumental heykəltəraşlığın inkişafı məsələsi elm üçün şəksiz maraq doğurur.

Son illərdə arxeoloji tapıntıların öyrənilməsi və Azərbaycanın maddi mədəniyyətinin digər abidələri belə bir mühakimə yürütməyə imkan verir ki, incəsənətin bu növü öz kökləri ilə əsrlərin dərinliyinə gedib çıxır. Son illərdə toplanmış arxeoloji material və Azərbaycanın maddi mədəniyyətinin abidələri burada klassik incəsənətin olması haqqında istər çox qədim dövrdə, istərsə də orta əsrlərdə onun inkişafı haqqında fikir söyləməyə imkan verir (21.61).

Azərbaycanda monumental daş heykəllərin yaradılması ənənəsi öz kökləri ilə qədim dövrlərə gedib çıxır. Bu cür heykəllərin ən erkən nümunələri Qobustanda və Abşeronda (Türkan kəndi) aşkar edilmişdir. Bu heykəllərin tunc dövrünə (e.ə. 2–3-cü minilliklər) məxsus olduğu qeyd edilir və bunlar kurqanlı məzarlıqların olduğu yerlərdə, habelə bəzi komplekslərin mərkəzində aşkar edilmişdir. Bu heykəllərin yerləşməsi şəraiti daş heykəllərin kult xarakteri daşıdığını göstərir; onların ölçüləri 1,5–2,5 m-dir. Bu heykəllər formalarının lazımınca işlənilməməsi ilə səciyyəvidir və daş sütunlara bənzər stellavari formalara meyil edir.

Bu cür abidələrə Muğanda və Qarabağ düzənliklərində rast gəlinir. Bu abidələrin çox hissəsi indi də min illərlə bundan qabaq yaradıldığı yerdədir. Oxra-ağ rəngli Abşeron qumdaşından, yaxud tünd-boz Qarabağ çaylaq daşından və bazaltdan yonulmuş daş heykəllər bizi nəinki adsız heykəltəraşların fərdi yaradıcılıq manerası ilə tanış edir, həm də onların yaradıcılarının dünyagörüşünü əks etdirir. Aydın məsələdir ki, tunc dövrünün bu abidələri kult əhəmiyyətinə malik idi və dəfnetmə ayinləri ilə bağlı olmuşdur.

Tunc dövründən sonra gələn monumental heykəltəraşlığın inkişafı dəmir dövrünə, daha doğrusu, Azərbaycan tarixində skif dövrünə (e.ə. VIII-VII əsrlər) təsadüf edir. Kür və Araz çayları arasındakı məkanda skif tayfalarının geniş yayılması hələ “tarixin atası” Herodot tərəfindən qeyd olunmuşdur. Herodot bu ərazini Skifiya adlandırmışdır.

Bu dövrün abidələri formaların və detalların daha çox işlənilməsi ilə fərqlənir, heykəltəraşlıq obrazlarının konkret antropoloji cizgiləri onlarda getdikcə daha çox üzə çıxır. Tunc dövrünün totem xarakterli sütunabənzər kult abidələri tədricən qəbilə və nəslin qəhrəmanlaşdırılmış atalarına çevrilir.

Skif dövründən sonra gələn hun dövründən da (e.ə. 3-cü əsr – eramızın 7-ci əsri) – Arazdan şimal tərəfdə çöllərə səpələnmiş xeyli monumental daş heykəl qalmışdır.

III-VII əsrlərdə Azərbaycan ərazisində bu cür heykəllərin meydana gəlməsi təsadüfi hal deyildir. Məlum olduğu kimi, həmin vaxt bu ərazidə onun bütün tarixində müstəsna əhəmiyyətini malik olmuş mühüm hadisələr baş vermişdi.

Bu tarixi dövr Azərbaycanda hun, sonra isə oğuz qəbilələrinin olması ilə bağlıdır; onlar Azərbaycan xalqının etnik tərkibinin formalaşmasında mühüm rol oynamışlar.

Azərbaycan ərazisində heykəllərin qoyulması ilə bağlı olan ayin VII-XI əsrlərdə yaşamış erməni, gürcü və ərəb tarixiçilərinin əsərlərində yaxşı işıqlandırılmışdır. Albaniya tarixçisi Moisey Kalankatlı özünün "Ağvan tarixi" əsərində ən qüdrətli döyüşçülərin və sərkərdələrin şərəfinə yaradılmış daş fiqurların rolu və əhəmiyyəti xüsusi qeyd edir.

*25. Daş balbal. Zirə, Abşeron, tunc dövrü.*



M.Kalankatlının əsərində biz şərəfinə abidə ucaldılmış matəm mərasiminin təsvirində maraqlı məlumatlar tapırıq. Bu mərasimlər xüsusi təntənə ilə keçirilirdi. Orada heç də təkcə mərhuma yas saxlanmır, həm də ölənin iştirak etdiyi vuruşmanı xatırladan səhnələr göstərir, rəqs edir, oxuyurdular. Bütün bunlar həlak olmuş igidin həyatını və qəhrəmanlığını insanlara xatırlatmaq üçün edilirdi.

Qəhrəmanın şərəfinə ucaldılmış daş heykəllər sonralar tədricən ziyarət yerlərinə çevrilirdi. İnsanlar isə onlara böyük ehtiramla və məhəbbətlə yanaşaraq, onları qoruyurdular. M.Kalankatlı yazırdı: "... Əgər kimsə onlara toxunmaq və onları murdarlamaq istəsəydi, Tanqrıxan Allahın özünün qəzəbinə gələrdi..." (50.36).

Monumental daş heykəltəraşlığının əsil çiçəklənmə mərhələsi Azərbaycan tarixinin Albaniya dövrünə təsadüf edir. Külli miqdarda olan bu abidələrin təhlili Albaniya abidələrinin varisliyinə qəti inam olduğunu söyləməyə imkan verir; bu abidələrdə skif və hun dövrləri abidələrinin tipoloji cizgiləri izlənilir. Bu heykəllərin nisbətən yaxşı qalması bütpərəstlik heykəlləri mədəniyyəti daşıyıcılarının plastik təfəkkürü xüsusiyyətlərinin bədii-semantik təhlilini aparmağa imkan verir. Bu heykəllərin

əksəriyyəti Şəfibəyli, Mollalar (Ağdam rayonu), Seyidsulan, Canyataq (Tərtər rayonu), Şatırlı (Bərdə rayonu), Xınıslı (Şamaxı), Dübəndi (Abşeron) kəndlərində və başqa yerlərdə tapılmışdı. Bu idolların orta ölçüsü 1,5 metrdir, lakin bəzilərinin hündürlüyü 3 metrə çatır.

Bu cür heykəllərin hazırlanması ənənəsi hələ qədim skiflərdə və hunlarda qeydə alınmışdır, sonralar monumental bütpərəstlik heykəltəraşlığı ənənələri xəzərlərdə, qıpçaqlarda, monqollarda və Avrasiya çöllərində yaşamış digər türk xalqlarında nəzərə çarpır. Ümumi cizgilərə malik olmasına baxmayaraq, müxtəlif regionlara məxsus heykəllərin formalarının üslublaşmasında və obrazların təsvirində bunların öz üslubi fərqləri vardır. Heykəllərin yan və arxa hissələri işlənilməmiş və öz stellayabənzərliyini saxlamışdır. Bütövlükdə fiqurların böyük əksəriyyəti əllərini sinəsində ibadət edən kişiləri təsir edir. Fiqurların hamısı üçpilləli quruluşa malikdir ki, burada baş, bədən və ayaqlar üfiqi xətlə-novça ilə bölünmüşdür. Heykəllər qurşağa qədər torpağa basdırılır və tamaşaçıya torpağa basdırılmış dua edən fiqurlar təqdim olunurdu. Heykəlin ön hissəsinin fəal heykəltəraşlıq cizgiləri və stellanın yan və arxa hissələrinin işlənilməməsi onu göstərir ki, heykəl kult mərasimləri zamanı dairə cızmamışdır.

*26. Daş heykəl. Qala, Abşeron, erkən Alban dövrü.*



Qədim Albaniyada bütün monumental heykəllərin tipoloji təhlili iki ikonoqrafik kanonu aşkar etmişdir ki, bütün Albaniya heykəlləri onlara əsasən yaradılmışdır: heykəllərin birinci tipi Tərtər rayonunun indiki ərazisində (Seyidsulan) yayılmışdı və fiqurun üz hissəsinin işlənilməsində böyük realizmi ilə səciyyələnir. Bu heykəllərin gözləri vardır, qaşüstü qövslər qabarıq verilmiş və burnun forması ötəri cızılmışdır.

İkinci ikonoqrafik tip indiki Ağdam rayonu üçün daha səciyyəvidir. Burada fiqurların aşağı və orta hissələri Tərtər fiqurları ilə eynidir, amma fiqurların sifətləri tamamilə mücərrəd şəkildə ifadə edilmişdir, bu fiqurlar "V" şəkilli novça kimi düzəldilmiş, yalnız burun aydın ifadə edilmiş və çənə olduqca şərti verilmişdir. Bərdə rayonunda (Şatırlı) aşkar olunmuş bu cür heykəllərdə çənələr əsla işlənilməmişdir.

Albaniya heykəllərinin hər iki tipi eyni tarixi dövrdə iki "məktəbin" heykəltəraşları tərəfindən yapılmışdır. Bu cür heykəllər təqribən eramızın IV əsrinin lap axırlarında hazırlanmağa başlamış

və bu iş Albaniyanın ərəblər tərəfindən istila edilməsinədək və burada islamın yayılmasına qədər davam etmişdir. İslam bu heykəllərə amansız müharibə elan edəcəkdi.

Albaniya heykəlləri Avrasiya çöllərinin müxtəlif vaxtlarda və müxtəlif tiplərdə yaradılmış heykəlləri dairəsinə daxildir; elmdə bu heykəllər şərti olaraq “daş idollar” və ya “qıpçaq idollar” adlandırılmışdır.

Bu monumental daş idolların qədim Albaniya qəbilələrinin bütpərəstlik kultunda yeri, əhəmiyyəti və rolunu həmin heykəllərin yaradıcılarının mənəvi və kult həyatının əsas cizgilərini üzə çıxaran ümumtürk mifologiyasına əsaslanaraq yenidən qurmaq olar.

Şərqi Avropa, Ön və Orta Asiya və Uzaq Şərq ənginliklərində yayılmış çoxsaylı erkən türk heykəllərinin arasında Albaniya heykəlləri öz üslubi cizgiləri ilə fərqlənir. Fiqurların, konkret portretlərin və etnoqrafik detalların işlənilməsi zamanı “təsviriliyin” yoxluğu bu heykəlləri daha çox öz erkən orta əsr sinxron qonşuları ilə deyil, daha qədim heykəltəraşlıq ilə, skiflərlə, hunlarla doğmalaşdırır. Bu heykəllərin bədii-tipoloji təhlili onların məhz skif ənənələrinə məxsus olduğunu göstərir. Skiflərdə bu cür heykəlin əhəmiyyəti və rolu başqa idi, nəinki erkən orta əsr türk qəbilələrində. Birincilər üçün bu cür heykəllər dini xarakter daşıyırdı və sitayiş obyekti idi, halbuki ikincilər üçün bu cür heykəl memorial xarakterə malik idi və əsasən, dəfnetmə yerlərində qoyulurdu. Skiflərdə bu cür heykəllər ulu əcdadın (demiurqun) rəmzi idi, sonra isə bu özünü hunlarda, peçeneqlərdə və başqalarında göstərərək, həlak olmuş konkret qəhrəmanları təsvir edirdi. Bu cür abidələrin skif (və Albaniya) tipi rəmzi və mücərrəd idi, sonrakı türklər arasında isə konkret tarixi və realist məna daşıyırdı.

*27. Daş heykəl. Mərdəkan, Abşeron, dəmir dövrü.*



Albaniya və digər Avrasiya heykəlləri arasında fərq artıq abidələrin öz mahiyyətində təzahür edir. Albaniya heykəlləri yalnız ibadət edənləri təsvir edir, halbuki başqaları əllərində ayini cam tutur. Bu cəhətdən Gilyom de Rubrukun şəhadəti səciyyəvidir. O, öz müasiri olan çöl sakinlərinin müxtəlif dəfnetmə ayinlərinin təsvirlərini qoyub getmişdir: “Komanlar ölmüş adamın məzarı üzərində böyük təpə düzəldir və ona heykəl ucaldırlar; bu heykəlin üzü şərqə çevrilmiş olur və o, əlində göbəyi səviyyəsində kasa tutur” (28.63).

Böyük Azərbaycan şairi Nizami də qeyd etmişdir ki, qıpçaqlar daş heykəllər qoyur və onlara

sitayiş edirlər. Çoxsaylı mənbələrin və daş heykəllərin təhlili mütləq belə bir nəticə çıxarmağa imkan verir ki, Albaniya abidələri əzəldən kult abidələri kimi yaradılırdı.

Bu cəhətdən Şamaxı rayonunda aşkar edilmiş heykəllər böyük maraq doğurur. 1946-cı ildə Xınıslıda tapılmış daş heykəl xüsusilə diqqətəlayiqdir. Heykəl yerli əhəngdaşından düzəldilmişdir. Heykəlin başı yoxdur, yuxarı və aşağı ətraflar isə yaxşı vəziyyətdə qalmışdır. Sol əl sağ döşün üstünə qoyulmuş, sağ əl aşağı salınmış və sol böyürə sıxılmışdır.

Heykəlin sol əlində altıguşəli ulduz nişanı vardır. Albaniya incəsənətinin tədqiqatçısı N.Rzayevin fikrincə, bu qəbilə nişanı ölmüş, qəbilə başçısının nəsil nişanıdır (57.180). Nəsilin adı isə, ehtimal edildiyi kimi, günəşlə bağlı idi, ona görə də N.Rzayev tapılmış fiquru "altı oğuz" adını daşımış nəsil rəhbərinin obrazı hesab etməyə maildir.

Lakin heykəl şumlama zamanı təsadüfən tapılmışdır. N.Rzayev hesab edir ki, bu heykəl "Altı oğuz" tayfası rəhbərinin qəbri üstündə qoyulmuşdu.

*28. Daş heykəl.*
*Kəlbəcər, dəmir dövrü.*



1959-cu ildə elə həmin yerdə yuxarı yarısı olmayan ikinci analoji heykəlin (hündürlüyü 1,35 metr) aşkar edilməsi göstərir ki, bu cür plastik sənət abidələri qədim ənənələrlə bağlı idi. Bu ehtimal D.A.Xəlilovun 1960-cı ildə Xınıslıda arxeoloji qazıntılarının nəticəsi ilə təsdiq olunur; orada daha iki başsız heykəl tapılmışdır ki, bunlar da V-VI əsrlərdə düzəldilmiş və Xınıslıda aşkar edilmiş (69.17) digər heykəl kimi, daş yeşik tipli dəfn qurğusu çatısının tikilməsi zamanı işlədilmişdir.

D.Xəlilovun müəyyən etdiyi kimi, heykəllərin Xınıslı tipi 3–4-cü əsrlərə qədər hazırlanırdı. Heykəllərin hazırlanmasının bu cür bədii plastik ənənəsi eramızdan əvvəl birinci minillikdə formalaşmış və b.e. IV əsrindən Azərbaycanda zərdüştlüyün və xristianlığın yayılması ilə əlaqədar olaraq dayandırıldı. Bununla yanaşı, Qafqaz Albaniyasının mədəniyyət mərkəzlərindən uzaqda olan rayonlarda plastik incəsənət ənənələri hələ uzun müddət mövcud oldu. Bu, daha sonrakı daş relyeflərin tapaılması ilə təsdiq olundu. Həmin relyeflərdə qədim mədəni ənənələr davam etdirildi.

Xınıslı plastika abidələri fiqurların iriliyi, monolitliyi ilə səciyyələnir ki, həmin



*29. Daş heykəl, Qəribli, Tovuz, e.ə. I minilliyin sonu.*

abidələrdə, bir qayda olaraq, bədənin hissələri incədən-incəyə işlənilməmişdir. Fiqurlar bütöv iri daşlardan yonulurdu.

Bu heykəllər üçün icra ustalığının nakamilliyi səciyyəvidir. Fiqurun çanaq hissəsi xüsusilə bəsit şəkildə yonulurdu, buna görə də ilk Xınıslı heykəlini səhvən qadın fiquru kimi qəbul etmişdilər. Bununla yanaşı, həmin abidədə əllərin işlənilməsinə xüsusi diqqət yetirilmişdir.

Digər bir abidə eramızdan əvvəl 1-ci minilliyin sonunda və eramızın 1-ci minilliyinin başlanğıcına aid edilir və Şamaxı rayonunun Dağkolanı kəndində aşkar edilmişdir. Qırxıqbaşlı kişinin bu fiquru bütöv əhəngdaşından yonulmuşdur. Bədənin hissələrinin zəif detallaşdırılması nəzərə çarpır; gözləri çuxurdadır, qulaqları səliqə ilə yonulmuşdur, lakin yüksək səviyyədə nəzərə çarpdırılmışdır, burnu (sonralar sınmışdır), ağzı və saqqalı, habelə paltarının ətəkləri qabarıq surətdə fərqləndirilmişdir. Heykəlin belində şaquli surətdə dərinləşdirilmiş xətt çəkilmişdir. Belin yuxarı hissəsində dördkünclü qabarıq çıxıntı, zənnimizcə, çiyinlərə qoyulmuş hörüyü andırır.

Dağkolanı heykəlinin proporsiyaları müxtəlif ölçülüdür: qırxılmış baş və geniş çiyinlər böyüdülmüş, əllər isə zəifləşdirilmiş ölçülərə malikdir. Çiyinləri qeyri-bərabərdir, boynu işlənilməmişdir. Bu, Şamaxı rayonunda aşkar edilmiş ilk fiqurdur ki, başı salamat qalmışdır, bu isə Xınıslı heykəllərinin hazırlanması metodikasına aydınlıq gətirə bilər.

Əllərin standart vəziyyəti Şamaxı rayonunun bütün daş fiqurlarını bir qrupda birləşdirir.

Qafqaz Albaniyasının plastik incəsənətinin ənənəsi, məlum olduğu kimi, orta əsrlərdə də davam etmişdir. Məsələn, Dağıstanda, Lenin rayonunun Mamaykutan qəsəbəsində başı qırxılmış və əlləri olmayan insanın yarımfiquru şəklində torpaqda qəbirüstü abidə aşkar edilmişdir.

Heykəl XIV əsrə aiddir və monumentallığı ilə fərqlənir. Geniş burnu və belinə sallanmış uzun hörüyü təsvir olunmuş adamı türk qəbilələrinə mənsub olduğunu nəzərə çarpdırır.

Buna bənzər qəbirüstü abidələr qədim zamanlarda da yonulmuşdur, onlar əllərin qarının üstünə qoyulması ilə fərqlənirdi. Dağıstan işıqları qəsəbəsində

aşkar edilmiş yastı-relyefli daş kişi fiquru buna nümunə ola bilər; həmin fiqur eramızdan əvvəl VI-V əsrlərə aiddir (5.164).

Köçəri skif tayfalarına məxsus bu qəbirüstü stella enli kəməri, əllərinin monolit aşağı hissəsinin vəziyyəti ilə Şamaxı rayonunun qəbirüstü fiqurlarından fərqlənir.

Yenə də orada aşkar edilmiş və sağ əlində xəncər tutmuş kişini təsvir edən başqa yastı-relyefli qəbirüstü stella da maraqlıdır. Stellanın eramızdan əvvəl VI-V əsrlərə aid olduğu göstərilir, Çeçen-İnquş MSSR-in Mesketı kəndində tapılmışdır. Burada bizi heykəlin kürəyində yonulmuş və hörüyün imitasiyası olan düzbucaqlı maraqlandırır. Biz bu cür təsviri Dağkolanıda tapılmış daş fiqurda da görürük. Məlum halda düzbucaqlı üfüqi və şaquli istiqamətlərin çoxsaylı xətləri ilə tamamlanmışdır, bu xətlər birinci halda yoxdur.

*30. Daş heykəl. Gavurqala, Ağdam, III-V əsrlər.*



Göründüyü kimi, nəzərdən keçirdiyimiz Çeçen-İnquşetiyada və Dağıstanda tapılan daha qədim daş qəbirüstü fiqurlar Şamaxı rayonunda tapılmış heykəldən istər heykəltəraşın iş metodu, istərsə də təsviri motivləri, plastik kompozisiyaları ilə fərqlənir.

Şamaxı heykəllərinin yeni nümunələrinin aşkar edilməsi bu rayonda onların yerli ayin ənənələri bazasında geniş yayıldığını təsdiq edir. Şamaxı rayonunun Çıraqlı kəndinin cənub-qərb ucqarında, köhnə qəbiristanda daş fiqurlar aşkar edilmişdir. Bu qəbirüstü heykəlləri D.Xəlilov memorial heykəllər sayır və onları eramızdan əvvəl I minilliyin sonlarına aid edir (70.23).

Təsviri motivlərinə və icra manerasına görə onlar bundan əvvəl nəzərdən keçirilmiş Şamaxı rayonu heykəllərinin eynidir. Bu və digər heykəllər politeist dinin məhsulu olmuşdur və idol pərəstişkarları tərəfindən plastik nümunələr kimi hörmətlə qarşılanır. Onlar allahların plastik nümunələri kimi deyil, daha çox qəbilə mühafizəçilərinin əcdadlarının qəhrəmanlaşdırılmış nümunələri kimi çıxış etmişlər.

Ola bilsin ki, onlar eramızın birinci əsrində Şamaxı rayonunda məskunlaşmış tayfaların hərbi-quldar zadəganlarının ideologiyası bazasında yaradılmışdır. Bu ideologiyanın əsasında köçəri tayfaların igid və adlı-sanlı döyüşçülərinin hünərlərinin təbliği dururdu. Xatırladaq ki, qədim heykəltəraşlar

*31. Daş heykəl. Şəfibəyli, Ağdam, III-V əsrlər.*





idolları təsvir edərkən müxtəlif akssesuarların köməyi ilə onların ilahi qüvvəsini nəzərə çarpdırırdılar.

Şamaxı heykəllərində isə hökmedici duruş yoxdur. Güman etmək olar ki, bu cür qəbirüstü fiqurlar ölənlərin, daha çox igid və adlı-sanlı döyüşçülərin plastik obrazlarını təcəssüm etdirir. Ola bilsin ki, Şərq türklərində olduğu kimi, köçəri döyüşçünün qəbri üstündə onun tərəfindən öldürülmüş düşmənlərin sayına görə yonulmamış daşlar (balballar) qoyulurdu. Beləliklə, məğlub edilmiş düşmənlər axirətdə öz qalibinə xidmət etməyə məhkum idilər. Göstərilən balballardan əlavə, şərq türklərinin qəbirləri üstündə mərhumun plastik obrazını təcəssüm etdirən daş fiqurlar qoyulurdu. Qədim türklər tərəfindən yaradılmış bu daş fiqurlar anma ayini ilə bağlıdır və onların ölmüş qəhrəmanlarını təsvir edir. Qədim türklərdə ölmüş adamın daş təsviri onun xeyratında basdırılmış adamın əvəzlənməsi üçün nəzərdə tutulmuşdu, yəni anma mərasimində "iştirak etmiş" ölən adamın ruhlarından birinin "yatağı" olmalı idi.

VII-IX əsrlərdə qəbirlərin üstündə daş fiqurların qoyulması ayini Şərq türkləri tərəfindən bütün Mərkəzi Asiyada geniş yayılmışdı.

Gavurqala zonasında (Ağdam və qonşu Tərtər rayonlarında) qeydə alınmış antropomorfik daş heykəllərin sayı ona çatır. Bunların hamısı sıx yerli

*32, 33, 34. Daş heykəllər, Bərdə, Tərtər, III-IV əsrlər.*



əhəngdaşından düzəldilmişdi və yalnız ölçüləri ilə fərqlənirdi (onların hündürlüyü 0,9 metrdən 3 metrədək idi). Azərbaycanda aşkar edilmiş bütün "daş qadınlar" Rusiyanın cənubunda və Sibirdə geniş tanınmış analoji abidələr dairəsinə daxildir, yəni nəzərdən keçirilən bütün heykəllər qədim türklərin, – azərbaycanlıların əcdadlarının qəbirüstü abidələridir.

Məlum heykəllərin üslubi xüsusiyyətlərini nəzərə alaraq, hesab etmək olar ki, onlar Şamaxı rayonunun abidələrinə nisbətən daha gec yaradılmışdır və ehtimala görə, eramızın IV-VII əslərinə aid edilə bilər.

Daş balballara gəldikdə isə, Azərbaycan ərazisində bu cür abidələr Şirvanda, Qarabağda və Muğanda aşkar edilmişdir.

*35. Daş heykəl. Şatırlı, Bərdə, III-V əsrlər.*



Düşmənlərin obrazları kimi, daş balballar, təbii ki, yerli sakinlərin (müsəlmanların) qəlbində ikrah, intiqam hissi doğurur və ya bütünlüklə məhv edilir, ya da torpağa basdırılırdı. A.D.Qraç hesab edir ki, balballların yaradılması bəşəriyyətin ən qədim ayini olan qurbankəsmə ayininin tənəzzül etməyə başlamasının əlaməti, onun son fazası idi (29.88–89).

Azərbaycanda bu ayinin ən inkişaf etmiş dövrü tunc dövrü ilə bir vaxta düşür; o vaxt axirət dünyasında qulluq etmək üçün kölələri öldürür və sahibləri ilə birlikdə basdırırdılar. Eramızın əvvəlində bu ayin kəskin surətdə dəyişildi. Türk xaqanlığı dövründə türklər öz qəbirləri üstündə balballların və heykəltəraşlıq idollarının qoyulması ilə kifayətlənirdilər.

Bəzən Şərq türklərinin yalnız çarları öz əsirlərini öldürür və qurbankəsmə qismində onları axirət dünyasına göndərirdilər.

575-ci ildə Bizans səfirləri bu cür səhnələrin şahidləri olmuşdular: "Türksanfın keçirdiyi matəm günlərindən birində onun yanına özünün ölmüş atasına atları ilə birlikdə qurban vermək üçün qandallanmış dörd əsir hun gətirmişdilər. Ölülər üzərində ayinləri türklər öz dilində "do-xia" adlandırırdılar".

Qeyd etmək lazımdır ki, insanın qurban kəsilməsi ayini ənənəyə görə türk sultanları tərəfindən və səlcuqların basqını dövründə icra olunurdu. Məsələn, səlcuqların Ermənistana üçüncü basqını dövründə (1054-cü il). Sultan Toğrulbəyin qoşunları bütün ölkəyə səpələndilər: "Həmin vuruşmada Toğrulun istəklilərindən birinin oğlu ağır yaralanmışdı. Sultan əsir düşmüş, öz qəhrəmanlığı ilə fərqlənmiş erməni döyüşçü Tatula bu sözlərlə müraciət etmişdi: "Əgər

o (yaralı) sağ qalsa, sən azad olacaqsan, ölsə, səni ona qurban kəsməyi əmr edəcəyəm" (36.154).

Azərbaycanda müsəlman qanunlarının hökm-fərma olduğu bir dövrdə bəşəriyyətin qədim qurbankəsmə ayini özünün tamamlayıcı, üçüncü fazasına daxil oldu: insanın qurban kəsilməsi əvəzinə qoyunları və başqa heyvanları qurban kəsməyə başladılar.

Qafqaz Albaniyasında yuxarıda göstərilən memorial heykəltəraşlıq abidələrindən başqa, kult xarakterli daş antropomorf fiqurlar da yaradılırdı. Məsələn, Tovuz rayonunun Qəribli kəndində 83 santimetr hündürlüyündə qadın fiquru aşkar edilmişdir. Bu fiqur üç ayrı-ayrı hissədən: baş, bədən və 20 santimetr uzunluğunda ayaqlardan ibarət idi. Fiqurun uzun başı qaba emal edilmiş boynunda yonulmuşdur, üzü ağzının və düzbucaqlı burnu ilə, təzad təşkil edən qaşlarının kəskin üfüqi cizgiləri ilə, qabarıq dairə formasında olduqca nəzərə çarpan qulaqları ilə fərqlənirdi. Nə qolsuz bədəni, nə də ayaqları əməlli-başlı emal edilməmişdi. Buna görə də fiqurun başı xüsusilə fərqlənir.

*36. Daş heykəl. Mollalar, Ağdam, III-V əsrlər.*





Başının sivri forması qədim insanın portretini təcəssüm etdirir. Qədim ayin nəticəsində qadının başına uzunsov forma verirdilər ki, bu da tayfa əlaməti idi. Deformasiyalar ayini I-VII əsrlərdə Qafqaz Albaniyasında geniş yayılmışdı və hun tayfalarına aid edilirdi. I-IVəsrlərdə hunların Albaniyada olmasını və IV əsrdə albanların xristianlaşdırılmasını nəzərə alaraq, Qəriblidə tapılmış və nəzərdən keçirdiyimiz heykəli I-IVəsrlərə aid etmək olar. Bu heykəlin bədənini böyük hissələrindən birində romblar zəncirəsi şəklində məhsuldarlıq və çoxalma nişanı vardır. Ola bilsin, heykəl məhsuldarlıq və hun mənşəli tayfanın ilahəsinin plastik obrazıdır. Onun miniatür ölçüləri interyerdə, ev şəraitində və ya məbəddə saxlanılması və pərəstiş edilməsi üçün nəzərə tutulduğuna dəlalət edir. İstisna deyildir ki, heykəl sonsuz adamların və quraqlıqdan əziyyət çəkən insanların ziyarət etdiyi bütpərəst məbəd-pirdə saxlanılırdı.

*37. Daş heykəl. Seyidsulan, Ağdərə, III-V əsrlər.*



Qədim Azərbaycanda dölləndirmə və çoxaltma ilahəsinə sitayiş edilməsi ideyası Qobustan petroqlifləri (Cahangirdağ, 1.3№-li qaya) və Mingəçevirdə tapılmış qab üzərində insanların cinsi əlaqəsini təsvir edən oyma rəsmlərlə (e.ə. I əsr – eramızın I əsri) təsdiq olunur. Bu qab üzərində və bir sıra heykəllərdə insanların təsvirinin tipoloji eyniyyəti insan rəsmlərinin və heykəllərin yaradılmasının formal-plastik metodlarının genetik qohumluğu haqqında fikir söyləməyə imkan verir. Həmçinin məlumdur ki, Azərbaycanın qədim türk tayfaları "nikahlama ilahəsinə" sitayiş edirdilər (61.161).

Qədim Azərbaycanın Mingəçevirdə tapılmış, heykəltəraşlıq portretinin yaxşı nümunəsi olan kəhrəbadan yonulmuş miniatür başcıq (1–2-ci əsrlər) heç də az maraqlı deyildir. Qədim insanın fərdi cizgiləri daş-kəhrəbada realist ustalıqla təcəssüm etdirilmişdir.

Daş heykəl Qafqaz Albaniyasının memarlıq abidələrində, xüsusən, Dərbəndin 6-cı əsrdə tikilmiş müdafiə qurğularında sintetik halda da tətbiq olunurdu. X əsrin əvvəllərində yaşamış ərəb tarixçiləri Dərbənd səddi haqqında danışarkən orada yerləşdirilmiş müxtəlif heyvanların təsvirlərini xatırladırlar. Bu mənbələrin məlumatına görə, Dərbənddə "Babülcihad" (həqq və etiqad darvazası) divarda iki sütun verilmişdir; hər bir sütunda şirin və ağ daşın təsviri vardır. Onlardan aşağıda iki daş şəkli çəkilmiş, daşların

üzərində isə iki şirin təsvirləri verilimişdir. "Darvazanın yaxınlığında insanın daşdan ibarət təsviri həkk edilmişdir; onun ayaqları arasında dişi tülkü heykəli, bu heyvanın ağzında isə üzüm salxımı təsvir olunmuşdur". Şəhərin kənarında "Məsruf sututarı" adı ilə məşhur olan sututar vardır. Oraya aparan pilləkənlə su az olanda sututara enirlər. Pilləkənin yan tərəflərində daşdan yonulmuş iki şir, onlardan birinin üzərində isə insanın daş heykəli vardır. Hakimlərin evi üzərində divardan çıxan iki şirin təsviri də daşdandır. Bab sakinləri deyirlər ki, bu, divarın tilsimbəndidir" (17.10).

Bu təsvirlərindən ağzında üzüm salxımı tutmuş dişi tülkünün xatırladılan plastik təsviri diqqəti xüsusilə cəlb edir. Bu cür təsviri motiv Cavanşirin heykəlinin pyedestalında artıq rast gəlinmişdir. Bu təsadüfi deyildir: Cavanşirin hakimiyyəti dövrü Dərbəndin müdafiə qurğularının tikilməsi dövrü ilə sinxrondur. Ehtimal ki, ağzında üzüm salxımı tutmuş dişi tülkünün təsviri Cavanşirin çar atributlarından biri olmuşdur.

Dərbəndin heykəltəraşlıq abidələri VI əsrdə Qafqaz Albaniyasının plastika ustalarının yaratdıqları diqqətəlayiq heykəllərin nümunələridir. Onuncu əsrdə yaşamış ərəb tarixçilərinin məlumatlarına görə, şəhərin qala divarlarında o relyeflər qoyulurdu ki, şəhərin sakinləri hunları şəhər divarlarının tilsimbəndləri hesab edirdilər. Qala divarlarının yanında və məsruf sututarının pilləkənlərində şirlərin və insanların fiqurları qoyulmuşdu. Dərbəndin sxematik fiqurlarının dekorativ xarakteri onları heyrətamiz monumental-

*38. Daş heykəl. Seyidsulan, Ağdərə, III-V əsrlər.*



lıqdan məhrum etmirdi. Plastik incəsənət ənənələrinin və əvvəlki əsrlərin animistik etiqadlarının davam etdirilməsidir. Dərbənd sututarını "qorumuş" heykəltəraşlıq fiqurları Qafqaz Albaniyasını məkrli ruhlardan qoruyan və içərisində maye saxlanan zoomorf qabların plastik fiqurlarını xatırladır.

Dərbəndin heykəltəraşlıq abidələrindən Dərbənd divarlarının darvazaları üzərində oyulmuş vahiməli şir fiquru salamat qalmışdır. Şirin əvvəllər günəşi, sonralar isə hökmdarların hakimiyyətini təcəssüm etdirən plastik təsviri Azərbaycan incəsənətində ənənəvi motivdir.

Masallı rayonunun Boradigah kəndində tapılmış bürünc şir fiquru şir fiqurlarının erkən nümunələrinə aiddir; fiqurun başı günəş tacı ilə bəzədilmişdir. O, Azərbaycanda zərdüştilik kultunun inkişafı dövrünə (III-VI əsrlər) aiddir. O vaxt ustalar kult əhəmiyyəti olan heyvanların fiqurlarını məharətlə tökürdülər.

*39. Daş heykəl. Xınıslı, Şamaxı, III-IV əsrlər.*



İnsan başlı şirin kiçik bürünc fiquru sonrakı dövrün nümunəsidir; günəşin şüaları ilə tamamlanan XII əsrə aid bu fiqur Örənqalada tapılmışdır. Bu fiqur, şübhəsiz, Eldəgizlər sülaləsindən (1136–1225) olan Azərbaycan Atabəylərinin şahlıq hakimiyyətinin rəmzi idi. Memarlıq qurğularında heykəltəraşlıq fiqurlarından sintetik istifadə ənənəsi orta əsr Azərbaycanında da davam etmişdir. "Bayıl daşlarında" barelyeflərin yonulması buna nümunə ola bilər.

Qafqaz Albaniyasının plastik incəsənəti qəbirüstü abidələrdə də (xaçdaş) aşkara çıxarılır; bu abidələr dekorativ-ornamental və təsviri motivlərə malik düzbucaqlı tava daşlarının görkəmi vardır.

Dağlıq Qarabağın Çanaqçı kəndinin düzbucaqlı tava daşları relyef təsvirlərinin motivlərinə görə Albaniya dövrünə aiddir. Birinci tavadaşının yuxarı yastı tərəfində qabarıq günəş haləsinin dairəsi vardır ki, bu da daşın yan tərəfində yerləşən xaçşəkilli günəş təsvirinin günəşin iki təsviri ilə müşayiət olunur. Xaç nişanları ilə yanaşı sağdan keçinin, soldan sağ əlində xəncər tutmuş atlının yastı-relyefli təsvirləri fərqlənir. Burada maraqlı orasıdır ki, atlının sol əli sinəsinə sıxılmışdır. Belə oxşar duruş Şamaxı rayonunda tapılmış heykəllərdə də qeyd olunmuşdur. Bu cür oxşarlıq bir-birindən uzaq ərazilərdə yaşayan qədim tayfaların etnoqrafik və plastik yaxınlığına işarə etmirmi?

Çanaqçı kəndində qəbirüstü relyefli tavadaşı salamat qalmışdır; öz təsviri motivlərinə görə

bu daş Albaniya dövrü incəsənətinə aiddir; onun yuxarı zolağında qonaqlıq səhnəsi təsvir edilmişdir, aşağı zolağında üç xaçı, üç altıbucaqlı və dörd günəş nişanını təsvir edən ornamental rozetkalar nəzərə çarpır. Bu cür günəş nişanlarının çox qədim prototiplərinə tunc dövrünün dulusçuluq məmulatının dib hissəsinin bəzəklərində rast gəlirik. Xaçların təsvirlərinə malik qabarıq qədim dövrü ilə əlaqələndirir. İnsan təsvirlərinin geyimi Mingəçevirin daş möhürü üstündə insanın kəsmə rəsmi kimi təsvir olunmuşdur; bu daş möhür eramızın III-IX əsrlərinə aiddir və günəşin altışüalı nişanına malikdir.

Bu nişan əsasında gemma N.Rzayev tərəfindən "Altı oğuz" türk tayfasının mədəniyyəti ilə əlaqələndirilir. O, Çanaxçı kəndində aşkar edilmiş qəbirüstü daşları da qədim oğuz tayfalarının mədəniyyəti irsinə aid edir.

*40. Kurqan hasarından daş üzərində relyef. Mərdəkan, dəmir dövrü.*



Düzbucaqlı tavadaşları şəklində qəbirüstü daşların yan süjetlərini biz abidənin özünün mərasimi mahiyyəti ilə əlaqələndiririk, onlar qəbirüstü daşın məzmununun və memoriallığının açılmasına xidmət edir. Buna görə daşın yan tərəflərində ölənin yerdəki əməllərinə həsr olunmuş səhnələr verilmişdir. Bu, digər birtipli qəbirüstü abidələrə də aiddir. Qədim qəbirüstü daşların bu xüsusiyyəti sonrakı dövrlərin qəbirüstü abidələrinin memorial xarakterinə uyğun gəlirdi.

Qoçun və at fiqurları şəklində qəbirüstü heykəlləri də, islam dövründə onların daha sonrakı mənşəyinə baxmayaraq, oğuzların qədim türk tayfalarının dəfn ayinləri ilə əlaqələndirmək lazımdır. Bu mədəniyyət Cənubi Qafqazda geniş yayılmışdı ki, bunu da köçəri türk tayfalarının otlaqlarla zəngin rayonlarda cəmləşməsi ilə əlaqələndirmək olar. Onlar daha çox Azərbaycan ərazisində aşkar edirik.

Qafqaz Albaniyası incəsənətinin inkişafının birinci dövründə dəfn mərasimlərində qoçun və atın müxtəlif təsvirlərindən apotropik qüvvəyə malik qəbir inventarı qismində istifadə olunurdu. Maraqlıdır ki, orta əsrlərdə qoçun və atın təsvirləri artıq qəbirüstü memorial abidə qismində qəbirlərin üstündə qoyulurdu. Bizə belə gəlir ki, bu cür qəbirüstü fiqurlardan birinci olaraq oğuz tayfaları istifadə etmişlər. Təsadüfi deyildir ki, Cənubi Qaf-

qazın bir çox rayonlarında atların və qoçların daş fiqurları ilə bu cür dəfnləri yerli sakinlər "oğuz zaqası" (oğuz qəbirləri) adlandırırlar.

Oğuzların qəbirləri üstündə atın və qoçun daş fiqurlarının qoyulması onların dəfn mərasimi ilə bağlı idi. Təəssüf ki, əlimizdə yazılı məlumatlar yoxdur. Analoji mərasimlərdən X əsrin əvvəllərində Türküstanın qərb ucqarlarında məskunlaşmış oğuz türklərinin dəfn ayinini xatırlatmaq lazımdır: "Əgər onların sırasından adam ölmüşdürsə, onun üçün evəbənzər böyük qəbir qazır, onu götürür, ona öz gödəkcəsini, öz kəmərini, öz kamanını geydirir, onun əlinə nabid (kefləndirixi içki) doldurulmuş taxta kassa qoyur, onun qarşısına nabidlə doldurulmuş taxta qab qoyur, onun bütün əmlakını gətirir və onunla bu evdə qoyurlar. Sonra onu orada oturdur, onun başı üzərində evin damını örtür, onun başı üzərində gildən alaçığabənzən örtük qoyur, onun atlarını, onların sayından asılı olaraq, götürür və onlardan yüzünü və ya iki yüzünü, yaxud birini öldürür və onların ətini, başından, ayaqlarından, dərisindən və quyruğundan başqa yeyirlər. Onlar, həqiqətən, bunların hamısını taxtaların üstünə sərir və deyirlər: "Bunlar onun atlarıdır, o həmin atların belində cənnətə gedəcəkdir" (53.63).

Ehtimal ki, Azərbaycanın qədim oğuz tayfaları da göstərilən dəfn mərasimini icra edirdilər. Onların nəsilləri isə orta əsrlərdə öz dəyişikliklərini

*41. Albaniya çarı Cavanşirin tunc heykəli, VII əsr.*





etmişlər: atın başını, ayaqlarını, dərisini və quyruğunu qəbirlərin üstünə sərmək əvəzinə daşdan hazırlanmış at fiqurları qoyurdular.

Qədim əcdadlarımız – maldarlar Azərbaycanın otlaqlarla zəngin olan bütün guşələrində dəfn ayinləri ilə əlaqədar olan atlar və qoçlar şəklində qəbirüstü heykəllər qoyub getmişlər. XIV-XIX əsrlərdə hazırlanmış bu daş fiqurlarda ərəb hərfləri ilə mərhuma həsr olunmuş yazılar, habelə əlində quş olan insanın qabarıq təsviri vardır. Bu təsvir, ola bilsin, mərhumun məşğuliyyəti olan ovçuluqla bağlıdır. Bəzən daş fiqurlar üzərində göstərilən təsvirlər əvəzinə Naxçıvan diyarından olub, Azərbaycan Tarixi Muzeyində saxlanılan daş qoyun heykəli kimi, bütöv qabarıq ov səhnəsinə rast gəlirik. Atın və qoyunun qəbirüstü daş fiqurlarının meydana gəlməsi əcdadlarımızın həmin dəfn mərasimi ilə bağlıdır. İbn Fədlan atın imitasiyası olan təsvirin qəbir üstündə qoyulması haqqında danışarkən bu barədə məlumat vermişdir. Bu dəfn mərasimi belə bir dini ideya ilə bağlıdır ki, at mərhumu cənnətə aparırdı.

*42. "Bayıl" daşlarının relyefləri. Bakı, XII-XIII əsrlər.*



Lakin Azərbaycan ərazisinə səpələnmiş Oğuz qolunun bəzi tayfaları, görünür, atların sayını qoruyub saxlamaq üçün dəfn mərasimi zamanı atların yerinə qoyunlardan istifadə edirmişlər. Sonra artıq qəbirlər üstündə qoçun daş fiqurları ucaldılırdı. Ayinin bu cür təzələnməsi oğuzların təsərrüfat həyatından irəli gəlirdi. Mifologiya da bunun təsdiq olunmasına xidmət edir. Məsələn, "Məlikməmməd" adlı Azərbaycan xalq nağılında qəhrəmanını zülmətli aləmə və ya işıqlı səltənətə aparmaq üçün iki qoç – ağ və qara yunlu qoçlar peyda olur (15.195).

Beləliklə, saysız-hesabsız daş at və qoç fiqurlarının dini-mifoloji kökləri bizi qədim zamanlara aparıb çıxarır. Həmin daş fiqurlar orta əsrlərdə düzəldilmişdir. Bu məsələdə oğuz tayfalarının bütpərəstlik dininə



*43. Qoç şəklində qəbirüstü daş heykəl. Qazax, XV əsr.*

və folkloruna islamın güclü təsirini nəzərə almaq lazımdır. Həmin din və folklor totemizm və i.a. kimi ən qədim dini xurafata əsaslanmışdır.

Azərbaycanda müsəlman dininin hökmran olduğu şəraitdə qəbirüstü abidələrin yeni formaları yaradılırdı. Qədim dövrün plastik təsvirləri əvəzində meydana gəlmiş qəbirüstü tavadaşları bəzək əşyalarının dekorativ-ornamental formalarını kəsb etmişdir.

Qədim zamanların plastik incəsənətinin nəzərdən keçirdiyimiz abidələri qədim Azərbaycanın təsviri sənətində bədii formaların zənginliyinə dəlalət edir. Bu sənət bədii-plastik formaların və dekorativ-ornamental motivlərin ənənəviliyini və özgünlüyünü xarakterizə edir.

Öz kökləri ilə qədim dövrün skif və hun abidələrinə gedib çıxan erkən orta əsr monumental heykəltəraşlığının varisliyinin qeyd olunması aparılmış tipoloji və bədii təhlilin mühüm nəticəsidir.



*44. At şəklində qəbirüstü daş heykəl. Şirvan, XVI əsr.*

## *KAMERA PLASTİKASI*

Məlum olduğu kimi, Azərbaycan ərazisində insanı təsvir edən ilk gil heykəlciklər eneolit dövrünə aiddir. Bunların azsaylı olmasına baxmayaraq, tarixçilərin və etnoqrafların tədqiqatları onların semantikası və təyinatı haqqında müəyyən rəy söyləməyə imkan verir.

Bütövlükdə insan heykəlciklərinin yayılması sahəsi Cənubi Qafqazı, Şimali Qafqazı, Orta Asiyanı, Ukraynanı və Avropanın cənub-şərq hissəsini əhatə edir. Ölkəmizin hüdudlarından kənarda insanın gil heykəlciklərinin yayıldığı ərazi bütün erkən əkinçilik məskənlərini əhatə edir.

Terrakotadan hazırlanmış heykəlciklərdən, ilk növbədə, əkinçiliyin və maldarlığın inkişafı ilə bağlı olan müxtəlif kultların icrası zamanı istifadə olunurdu. Buna görə də onların adları müxtəlif olmuşdur. Onlar məhsuldarlığın himayədarı, ocağın və mərhumun ruhunun və s. qoruyucusu olan İlahə-Ananın simvolik obrazları kimi çıxış edir. Qədim zamanlarda insanın həyatı bir çox cəhətdən məhsuldan asılı olduğu vaxt məhsuldarlıqla bağlı kult geniş yayılmışdı. Əkinçiliklə və maldarlıqla məşğul olan tayfalar təbiətin fövqəltəbii qüvvələrinə inanmış və məhsuldarlıq ideyası ilə bağlı olan ayinlər yaratmışlar. Kiçik qaba gil heykəlciklər bu kultlarla bağlıdır.

İbtidai heykəltəraş öz əsərlərinə simvolik məna verdiyinə görə erkən əkinçilik məskənlərində tapılmış insan heykəlcikləri öz formalarına görə fərqlənir. Z.A.Abramova zahiri görkəminin fərqlərinə görə heykəlcikləri iki qrupa ayırır: 1) iri, qabarıq qarnı malik, əcdadın ulu nənəsi olan ilahəni təsvir edən qadın fiqurları; 2) ovçuluq magiyası ilə əlaqədar yaradılmış arıq bədənli qadın fiqurları (14.116–117). S.N.Bibikovun fikrincə, iri bədəni ilə fərqlənən qadın fiqurları məhsuldarlıq kultu ilə əlaqədar olaraq hazırlanırdı. Çılpaq şəkildə, qabarıq döşləri, qarnı və ombaları nəzərə çarpdırılan, qadın fiqurunun təsviri – bütün bunlar ona dəlalət edir ki, fiqurlar məhsuldarlıq kult ayininin icrasına xidmət edirdi. Körpə uşaq anasının döşündən süd əmir, görünür, bununla əlaqədar qadın heykəlciklərinin məhsuldarlıq simvolu olan döşləri çox qabarıq təsvir edilirdi. Qadın döşlərinə fövqəltəbii qüvvə verilirdi ki, bu da müxtəlif xalqlar arasında toplanmış etnoqrafik məlumatlarla təsdiq olunur (25.122).

Qədim əkinçilər bilirdilər ki, bol məhsul təkcə torpağın münbitliyindən deyil, bir sıra digər amillərdən də asılıdır; onlar xüsusən quraqlıqdan qorxur, qadın heykəlciklərindən istifadə edərək, rütubətin və yağışın çağrılması ayinlərini icra edirdilər.

Qədim insanların təsəvvüründə qadın məhsulun və ailə prioritetinin qayğısına qalan qüvvə hesab olunurdu. Bu ideyanın meydana gəlməsi, ən əvvəl, qadının uşaq doğmaq qabiliyyəti ilə bağlıdır. Qədim insanların təsəvvürünə görə, qadının özünün məhsuldarlığı tayfanın və icmanın rifahını təmin etməli idi.

İnsanın gil heykəlciklərinin ocaqlar yanında, yaxud onların yaxınlığında çox tez-tez aşkar edilməsi onların ocaq kultu ilə əlaqəsini göstərir.

Ailənin rifahı, xüsusən, ilin soyuq fəslində, odun qorunub saxlanması ilə xeyli dərəcədə bağlı idi. Görünür, bu fakt insanların təsəvvüründə odu müqəddəsləşdirərək, onların fövqəltəbii himayədarına çevrilən od kultunu yaradırdı. İnsanların bu havadarı necə təsəvvür etdiklərindən asılı olmayaraq, həmin ideya da gil heykəlciklərdə öz əksini tapmışdır. Daha doğrusu, ocaq, od havadarının simvolu olan gil heykəlciklər yaradılırdı.

Ocağın yanında aşkar edilmiş heykəlciklər, əsasən, qadını təsvir edirdi və başqaları ilə müqayisədə daha diqqətlə hazırlanmışdı. Bunu onunla izah etmək olar ki, onlar daimi istifadə üçün nəzərdə tutulurdu.

Heyvanları təsvir edən gil fiqurcuqlar da müəyyən əhəmiyyətə malik idi. Azərbaycan ərazisində öküz, qoç, at, it, donuz fiqurlarına və başqa heyvanların fiqurlarına eneolit dövründən rast gəlinir. Onların meydana gəlməsi totemizm ideyaları ilə bağlıdır. Fiqurların əksəriyyətini öküz fiqurları təşkil edir ki, bu da təsərrüfatda həmin heyvanın rolu ilə bağlıdır. Öküz qədim insanların təsəvvürlərində mühüm yer tuturdu.

Sonda belə bir nəticəyə gəlmək olar ki, Azərbaycanın müxtəlif rayonlarında arxeoloji qazıntılar zamanı tapılmış heyvan fiqurları totemik ideyaların təsiri altında yaradılmışdı və bolluq, məhsuldarlıq, qənaətkarlıq və mərdlik simvolları idi.

Azərbaycanda ən erkən terrakota heykəlciklərinə eneolit və tunc dövrünün əkinçilik məskənlərində rast gəlinir. Şomutəpədə, Qarğalartəpəsində, Çalağantəpədə və bir sıra digər yaşayış məskənlərində koro-plastikanın tək-



*45. Terrakota fiqurcuqları. Molla-İsaqlı, İsmayıllı, I-II əsrlər.*

tük nümunələri aşkar edilmişdir. Əlimizdə olan az miqdarda heykəlciklər tunc dövrünün abidələrindən törəmişdir. Onlar, məsələn, Kültəpədə, Naxçıvan Muxtar Respublikasının ərazisində, Babadərvişdə, Uzuntəpədə, Günəştəpədə tapılmışdır. Bu heykəlciklər varislik əlaqəsi ilə, zahiri əlamətlərinə və hazırlanması texnikasına görə xarakterizə olunur.

İnsanın gil heykəlciklərinə və heyvan fiqurlarına qazıntılar zamanı müxtəlif yerlərdə: ocaqların yanında, qəbirlərdə, yaşayış binalarının qalıqları arasında, gilbişirmə sobalarında və i.a. rast gəlinir. Bu, insanın gündəlik həyatı ilə onların sıx əlaqəsini göstərir. Tədqiq olunan materialların tapılması şəraiti də onların adının və semantikasının müəyyən olunmasına kömək edir.

Terrakota heykəlciklərinin istehsalı beş ardıcıl mərhələni ehtiva edir: 1) xəmirin hazırlanması, 2) əllə qəlibləmə, 3) bişirmə ərəfəsində düzəliş, 4) bişirmə, 5) rəngləmə (bir sıra hallarda). Lakin bişirilməmiş fiqurcuqlar da tapılmışdır.

Ən qədim gil heykəlciklər, əsasən, insanların və müxtəlif heyvanların fiqurcuqları ilə təmsil olunur. Onların əksəriyyəti yaxşı üyüdülmüş gildən hazırlanmışdır. Onların hamısı kiçikölçülüdür. Məhsulun rəngi və möhkəmliyi bişirmənin səviyyəsindən asılıdır. Qeyd etmək lazımdır ki, gil heykəlciklər gil qablara nisbətən daha aşağı temperaturda bişirilirdi; onların keyfiyyəti bunu təsdiq edir.

Qədim əkinçilik məskənlərində geniş yayılmış terrakota heykəlcikləri Avrasiya materiki boyunca yerləşmiş əkinçilik mədəniyyətinin bir çox zonaları üçün səciyyəvidir. Azərbaycanın müxtəlif vaxtlarda yaradılmış abidələrinin çox hissəsi üçün insanın və heyvanların terrakota heykəlciklərinin tapılması əsas səciyyəvi xüsusiyyətlərdən biri sayılır. Bu ərazidə plastikanın iki tipinə – heykəlciklərə və qabların səthində yapma təsvirlərə rast gəlinir; bu barədə hazırkı tədqiqatın üçüncü fəslində bəhs olunacaqdır.

Eneolit və tunc dövrünün plastikası azsaylıdır – 5 antropomorf təsvir və 36 zoomorf təsvir (biri eneolit və 35-i tunc əsrinə aiddir). Lakin onun hərtərəfli öyrənilməsi və məzmununun başa düşülməsi üçün biz Ermənistanın, Gürcüstanın, Orta Asiyanın və s. təkkultur və sinxron abidələrindən dərc olunmuş plastikanı cəlb etmişik. Bişirilmiş heykəlciklər nisbətən yaxşı qalmışdır. Tədqiq etdiyimiz heykəlciklərdən üçü bişirilmişdir. Heykəlciyin başı, əlləri və ayaqları sınmışdır, lakin salamat qalmış hissələr möhkəmliyi ilə fərqlənir. Bu cür heykəlciklər qəlibə salındıqdan sonra sobalarda bişirilmiş, bu zaman bişirmənin səviyyəsindən asılı olaraq gil boz, çəhrayı, qırmızı, narıncı və ya qara rəng almışdır. Bəzən, bişirilmədən asılı olmayaraq, heykəlcikləri müxtəlif rənglərlə boyayırdılar. Əlimizdə olan iki nüsxədə boyama izləri qalmışdır.

Tədqiq etdiyimiz heykəlciklər arasında ikisi bişirilməmişdir, çox pis qalması ilə fərqlənir. Onların yuxarı təbəqəsi rütubətin təsiri altında ovxalanır.

Azərbaycan abidələrinin öyrənilən dövrünün bütün terrakota heykəlcikləri üçün müəyyən üsulla qəlibləmə səciyyəvidir. Əksər hallarda heykəlin başı şərti olaraq, yaxud konusşəkilli çıxıntı halındadır, çox vaxt əllər və ayaq-

lar da şərti verilmiş, yaxud əllər əvəzinə çiyinlərdə çıxıntılar vardır, ayaqlar konusşəkilli çıxıntı kimi verilmişdir. Əsasən, qadın heykəlciklərində ayaqlar bitişik, kişi heykəlciklərində isə ayrı verilmişdir.

Cinsi əlamətlərə görə eneolit dövrünün tunc dövrünün Azərbaycan plastikası qadın və kişi heykəlciklərinə bölünür, onlar zahiri görkəminə və ikonoqrafik xüsusiyyətlərinə görə fərqlənir. Qadın heykəlcikləri üslubuna və məzmununa görə öz aralarında oxşardır, lakin müxtəlif duruşlarda – ayaq üstə, yaxud çömbəlmiş halda təqdim olunmuşdur. Həm də hər ikisi üçün bədənin yuxarı və aşağı hissələri arasında proporsional uyğunsuzluq səciyyəvidir. Sonuncusu eneolit və tunc dövrünün bütün abidələrindən olan heykəlciklər üçün səciyyəvidir. Heykəlciklərin əksəriyyətinin başı pis hifz olunmuşdur, ayaqları və əlləri sınmışdır ki, bu da ölçülərin müəyyən edilməsinə mane olur. Bizə məlum olan beş insan heykəlciyindən yalnız kiçikölçülü olan biri nisbətən yaxşı qalmışdır. Heykəlciklər ölçüsünə görə orta hesabla 4–20 santimetr arasında ləngər vurur ki, bu da Azərbaycandakı tapıntıları Qədim Şərqin qədim əkinçilik məskənlərində aşkar edilmiş terrakota heykəlcikləri ilə yaxınlaşdırır.

Eneolit və tunc dövrünün (biri istisna olmaqla) qadın və kişi heykəlcikləri çılpaqdır. Bütövlükdə bu təfsir göstərilən dövrdə geniş yayılmışdı. Çılpaq qadın fiqurcuqlarında ombalar çox qabarıq verilmiş, döşlər yarımkürəşəkilli çıxıntılar kimi təsvir edilmiş, bel incədir, cinsi əlamətlər çox vaxt şərti işarələrlə verilmişdir.

Eneolit və tunc dövrünün antropomorf heykəlciklərini öz bədii həllinə görə iki qrupa ayırmaq olar: sxematikləşdirilmiş və realist qruplar. Birinci qrupa Qarğalartəpəsində və Üzərliktəpədə aşkar edilmiş qadın heykəlcikləri daxildir. Onlar üçün baş əvəzinə konusşəkilli çıxıntı və əllərin yoxluğu səciyyəvidir. Qarğalartəpəsində tapılmış heykəlciyin ombalarında buğda dənlərindən batıq yerlər qalmışdır ki, bu da məhsuldarlığın və münbitliyin artırılması mərasimlərində onun iştirakını bir daha təsdiq edir.

Şomutəpədə tapılmış qadın heykəlciyi, Babadərvişdə və Qızıl Vəngdə aşkar edilmiş kişi heykəlcikləri ikinci qruppa aiddir. Onlarda bədənin ayrı-ayrı hissələri, paltar, bəzək əşyaları (yapışdırma) aydın ifadə edilmişdir ki, bu da realist üsluba can atıldığına dəlalət edir.

Şomutəpə mədəniyyətinə aid olan, qazıntılar zamanı aşkar edilmiş iki insan heykəlciyi eneolit dövrünün Azərbaycan abidələrindən nəşət edir. Hər iki heykəlcik qadın təsviridir. Bu heykəlciklərdən biri eneolit dövrünə aid olub, Şomutəpə yaşayış məskənində (Qazax rayonu), digəri Qarğalartəpəsi yaşayış məskənində tapılmışdır.

Şomutəpədə tapılmış heykəlcik çömbəlmiş qadını təsvir edir, onun başı qoparılmışdır, beli incədir, ombaları və döşlər çox qabarıq verilmiş, ayaqları birləşdirilmişdir. Sol döşü qoparılmışdır. Onun üstündə yuxarıdan aşağıya endirilmiş hörükləri təsvir edən dalğalı xətlər çəkilmişdir. Ayaqlar da üfüqi xətt boyunca bu cür cizgilərlə örtülmüşdür. Qurşaqdan aşağı ayaqların uclarına

qədər navalça uzanıb gedir. Cinsi əlamət xırda kərtiklə verilmişdir. Ümumiyyətlə, gövdənin yuxarı və aşağı hissələri arasında aşağı hissənin qabarıqlığı ilə xüsusilə nəzərə çarpdırılan uyğunsuzluq müşahidə olunur.

Bu cür qadın heykəlciklərinin yayıldığı ərazi çox genişdir, o, Kiçik və Ön Asiyanın qədim əkinçilik məskənlərini əhatə edir, hərçənd buradan nəşət edən qadın heykəlcikləri ikonoqrafik əlamətləri ilə fərqlənir.

Buna baxmayaraq, Azərbaycan eneoliji plastikası ilə Ön Asiyanın plastikası arasında müəyyən oxşarlıq vardır. Ən əvvəl, o, başın konusşəkilli çıxıntısı, belin incəliyi, bədənin aşağı və yuxarı hissələri arasında uyğunsuzluq və s. ilə fərqlənir.

Azərbaycan ərazisində tunc dövrünün yaşayış məskənlərində aparılmış arxeoloji qazıntılar nəticəsində üç insan heykəlciyi aşkar edilmişdir: kişini təsvir edən ikisi zahiri görkəminə görə xeyli fərqlənir; üçüncüsü qadını təsvir edir.

Babadərvişdə aşkar edilmiş ilk kişi heykəlciyi təsərrüfat çalasında tapılmışdır. Bu heykəlciyin yalnız bədəni salamat qalmışdır. Açıq-boz rəngli bu heykəlcik bişirilmışdır. Onun belinə ön tərəfdən ucları sallanmış, oyma ornamentlə bəzədilmiş kəmər bağlanmışdır.

Eneolit dövrünün heykəlciklərindən fərqli olaraq, bu heykəlciyin ayaqları əyilməmişdir, bədəni isə proporsional şəkildə hazırlanmış, daha doğrusu, bədənin yuxarı və aşağı hissələri arasında uyğunsuzluq müşahidə olunmur. İkinci kişi heykəlciyi Qızıl Vəng monastırı (Naxçıvan) yaxınlığında tapılmışdır. Üzünün cizgiləri aydın verilmiş, başı papaqda təsvir edilmiş, papağın altından saçları sallanmışdır. Sifətində bığları və saqqalı təsvir olunmuşdur. Sol əli belindədir, sağ əli qoparılmışdır. Heykəlcik paltarda təsvir olunmuşdur: onun əynində uzunətəkli çuxa (üst geyim), papaq və ayaqqabı vardır. Yerə dəyən çuxasının ətəkləri öndən və arxadan qövsvari şəkildə kəsilmişdir. Belinə ucla-

*46. Terrakota fiqurcuqları. Füzuli I-II əsrlər.*



rı sallanan qurşaq bağlanmış, ön tərəfdən düyünlənmişdir. Sifəti ağ boyaq ilə rənglənmiş, çəkmələri və paltarının ətəkləri isə qırmızı rəngə boyanmışdır.

İbtidai cəmiyyətin incəsənətində və ideologiyasında tunc dövrünü dövründə insan getdikcə daha böyük yer tutmağa başladı. Daş əsrində heyvanları insanlara nisbətən daha tez-tez təsvir etdikləri halda, tunc əsrində artıq əks nisbət əsas götürülür. Bunu əkinçiliyin və maldarlığın intensiv inkişafı ilə də izah etmək olar; həmin dövrdə insan və heyvan əsas qüvvə kimi göstərilir.

Tunc dövründə Azərbaycan ərazisində kişi heykəlcikləri də peyda olur, bunlar icmanın daxilində patriarxal münasibətlərdən danışmağa əsas verir.

Eneolit dövrü üçün səciyyəvi olan qadın kult heykəlcikləri kişi heykəlcikləri tərəfindən sıxışdırılıb çıxarılır; bunu Qızıl Vəng yaxınlığındakı məskəndə tapılmış şəkilli gil heykəlciklərin parçalarından görmək olar. Qızıl Vəngdə tapılmış heykəlciyin ayaqlarına çəkmə geydirilmişdir. Heykəlcik eramızdan əvvəl 2 mininci ildə yaradılmışdır.

Ağdam yaxınlığındakı Üzərliktəpədə aşkar edilmiş tunc dövründə üçüncü insan heykəlciyi yaxşı ovulmuş gildən hazırlanmışdır. Bu heykəlcik üslublaşdırılmış qadın fiqurunu təsvir edir. Heykəlciyin əlləri və ayaqları qoparılmış, uzun boynu əyilmiş qarmaqşəkilli çıxıntı ilə tamamlanır. Boyunun sol tərəfində naxışlarla bəzədilmiş boyunbağı vardır. Əvvəlki heykəlciklərdən fərqli olaraq, döşləri çox zəif nəzərə çarpır, ombaları çox qabarıqdır. Heykəlciyin salamat qalmış hissənin ümumi hündürlüyü 7,5 sm-ə bərabərdir.

Azərbaycanın eneolit və tunc dövrü insanının heykəlcikləri hazırlanma texnikasına və ikonoqrafik göstəricilərinə görə həmin vaxt Ön Asiyada geniş yayılmış heykəlciklərlə müəyyən oxşarlığı aşkara çıxarır. Bununla birlikdə, onların bəzi yerli səciyyəvi cəhətləri vardır. Bu heykəlciklərin qalın ombaları vardır, onlara paltar və ayaqqabı geyindirilmişdir və i.a.

Qarğalartəpəsi yaşayış məskənində tapılmış heykəlcik ikonoqrafik əlamətlərinə görə Tripoli mədəniyyətinin erkən mərhələsinin qadın heykəlcikləri ilə də yaxın oxşarlığı vardır.

Başqa abidələrdən, xüsusən, Cənubi Qafqaz və Ön Asiya məskənlərindən alınmış materialların müqayisəli öyrənilməsi oxşarlığın bəzi cəhətlərini aşkar etməyə imkan vermişdir ki, bu da onu göstərir ki, eneolit və tunc dövrü Azərbaycanının əkinçi-maldar tayfaları Qədim Şərq incəsənəti ilə tanış idilər və bu regionlar arasında qarşılıqlı əlaqələr mövcud idi. Lakin Azərbaycan plastikasının inkişafında özgünlü bədii xüsusiyyətlər, hər halda, üstünlük təşkil edir.

Azərbaycan ərazisində eneolit və tunc dövrü heyvanlarının heykəlcikləri insan heykəlciklərindən qat-qat artıqdır. Lakin sonunculardan fərqli olaraq, çox qaba şəkildə hazırlanmışdır. Bədənin ayrı-ayrı hissələri arasında uyğunluğa riayət olunmamışdır; heykəlciklər bişirilmədiyinə görə yaxşı qalmamışdır. Fiqurcuqlar, əsasən, ev heyvanlarını – qaramalı və davarı, habelə atları və itləri təsvir edir. Elə heykəlciklər vardır ki, onların zahiri görünüşünü müəyyən etmək mümkün deyildir. Bununla birlikdə, kobud yonulmasına baxmayaraq,

bir çox fiqurcuqlar nisbətən realistcəsinə hazırlanmışdır. Heykəltəraş təsvir olunan heyvanın bütün səciyyəvi tərəflərini göstərməyə çalışmış və çox vaxt öz məqsədinə müəyyən dərəcədə nail olmuşdur.

Eneolit dövrünün yaşayış məskənlərində cəmi bir zoomorf fiqurcuq tapılmışdır. Bu, Ağdam rayonunun ərazisində Afatlı kəndinin yaxınlığındakı Çalağantəpədə aşkar edilmiş donuz başıdır. Uzunsov sifəti, oval çevrəsi vardır, onun üzərində çəkilmiş xətt ilə ağzı və oval çuxurları – gözləri və burnu təsvir edilmişdir. Həmin fiqur bütün Cənubi Qafqazın eneolit abidələrində yeganə fiqurdur ki, bu da adı çəkilən ərazidə eneolit dövrünün zoomorf plastikasının mövcud olduğunu da göstərir.

Kültəpədə (Naxçıvan) aşkar edilmiş 25 heyvan fiquru məlumdur ki, bunlar Azərbaycan Tarixi Muzeyinin fondlarında saxlanılır. On üç fiqur öküzü təsvir edir. Onlar daha realist şəkildə verilmiş, bədənin ayrı-ayrı hissələri göstərilmişdir. Onlar tipoloji cəhətdən ayaqların modelləşdirilməsi ilə fərqlənir. Bəzilərində ayaqlar konusvaridir, digərlərində düzbucaqlıdır. Lakin onların hamısı bədəninin uzadılması, uzun sifəti ilə səciyyələnir ki, bu sifətdə bəzən gözlər və ağız təsvir olunmuşdur. Fiqurun boynunda çox vaxt üfüqi dəlik açılmışdır. Onların bəzilərinin belində xırda dəyirmi yapışdırılmış hissələr vardır.

Fiqurlar zərif işlənilmiş gildən hazırlanmış, bişirilmiş və ya onlarda bişirilmə izləri yoxdur. Ölçüləri 4–7 santimetrdir.

Azərbaycanda erkən tunc əsrinin digər abidələrində də öküz fiqurcuqları üstünlük təşkil edir. Məsələn, Babadərvişdə, Günəştəpədə, Mişarçayda və



*47. Terrakota fiqurcuqları. Molla-İsaqlı, İsmayıllı, I-II əsrlər.*

başqa yerlərdə tapılmışdır. Onlar pis qalmışdır, amma bəzi əlamətlərinə görə güman etmək olar ki, öküzü təsvir edir.

Babadərviş məskənində aşkar edilmiş cöngə fiqurcuğu daha maraqlıdır. Onun bir-birindən xeyli aralı buynuzları vardır (bir buynuzun yarısı qoparılmışdır). Ayaqları aralıdır. Boz gildən hazırlanmış, bişirilməmişdir. Salamat qalmış hissəsinin uzunluğu 3,5 sm-dir.

Günəştəpə yaşayış məskənində heyvan fiqurcuqları da aşkar edilmişdir. Onlardan ikisi cöngələri təsvir edir. Birincisinin yalnız bədəni salamat qalmışdır. Onun boynunda, Kültəpədəki fiqurlarda olduğu kimi, üfüqi vəziyyətdə deyil, şaquli vəziyyətdə, yuxarıdan aşağıya doğru açılmış dəliyin izi vardır. Dal ayaqları müəyyən məsafədə yerləşmişdir. Quyruğunun altında çuxur vardır. Gil çəhrayıvaridir, bişirilməmişdir. Elə bu abidənin ikinci fiqurcuğunda boyundakı dəlik də şaquli vəziyyətdə yerləşmişdir. Ayaqları kiçikdir.

Mişarçay yaşayış məskənində qazıntılar zamanı Talış-Muğan arxeoloji ekspedisiyasının tapdığı heyvan fiqurcuqları da maraqlıdır. Mişarçay yaşayış məskənində aşkar edilmiş gil fiqurcuqların yalnız parçaları qalmışdır, amma ayrı-ayrı parçalarda hifz olunmuş əlamətlər heyvanın növünü müəyyən etməyə imkan verir, görünür, 4 fraqment 4 öküz fiqurcuğuna məxsus imiş.

Ev davarının plastik təsvirləri, əsasən, qoyun və keçi heykəlcikləri ilə təqdim olunmuşdur. Dörd keçi fiqurcuğu və iki toğlu fiqurcuğu vardır. Təəssüf ki, onlardan heç biri yaxşı qalmamışdır. Onları bir neçə əlamətlərinə görə fərqləndirmək mümkündür. Məsələn, bir keçi fiqurcuğunda baş və saqqalı xatırladan xırda çıxıntı ilə baş salamat qalmışdır. Biri burnu, digəri alnı ifadə edir. Bir buynuz salamat qalmışdır. Fiqurcuq açıq-sarı gildən hazırlanmış, amma bişirilməmişdir. İkinci keçi fiqurcuğunda da baş salamat qalmışdır. Gözləri nöqtələrlə verilmişdir. Qoparılmış buynuzların istiqamətinə görə müəyyən etmək olar ki, onlar geriyə əyilirmiş. Onların oturacağına xırda düymələr bərkidilmişdir; ehtimal ki, bu düymələr qulaqları təsvir edir. Fiqurcuq açıq-sarı gildən yapılmış, amma yandırılmamışdır. Öküz fiqurcuğunda olduğu kimi, boynunda dəlik vardır.

Üçüncü keçi fiqurcuğundan ancaq başın bir hissəsi tapılmışdır. Bir buynuz salamat qalmışdır. Alnında dəliklər açılmışdır. Çənəsi sınmışdır. Oturacağında, ola bilsin, qulaqları təsvir edən buynuz-çuxurlar vardır. fiqurcuq yaxşı təmizlənmiş boz gildən hazırlanmış, amma bişirilməmişdir.

Uzun sifəti olan sonuncu keçi fiqurcuğu yaxşı qalmışdır. Boynun bədənlə birləşdiyi yerin yanında kiçik çıxıntı ilə saqqal göstərilmişdir. Sındırılmış buynuzların izlərinə görə müəyyən etmək olur ki, buynuzlar geriyə əyilibmiş.

Toğluların fiqurları fraqmentar xarakter daşıyır. Onlardan biri çox kiçik ön hissə ilə təqdim edilmişdir, gözlər nöqtələr şəklində çuxurlarla, qulaqlar yapma çıxıntılarla göstərilmişdir. İkinci fiqurcuğun buynuzu və üç ayağı qopmuşdur, silueti dəyirmidir. Gözlər didilmiş dairəciklərlə, burun dəliklə göstərilmişdir. Hər iki fiqurcuq yaxşı təmizlənmiş açıq-sarı gildən hazırlanmış, amma yandırılmamışdır.

Davar fiqurcuqları tunc dövrünün Azərbaycan ərazisində tapılmış digər abidələrində məşhurdur. Onların arasında beş qoçun fiqurcuğu vardır. Günəştəpədə aşkar edilmiş iki qoçun fiqurcuğu xüsusi maraq doğurur. Onlardan birinin dal ayaqları qopmuşdur. Digər buynuzun salamat qalmış hissəsi burulmuşdur. Quyruq yumaqşəkilli çıxıntı ilə (onun bir hissəsi qırılmışdır) göstərilmişdir. Rəngi bozdur, yaxşı bişirilmişdir. İkinci fiqurcuğun başı və üç ayağı sınmışdır. Quyruğu bildirən yumaqşəkilli çıxıntı da vardır.

Bir qoçun fiqurcuğu Uzuntəpə yaşayış məskənindən məlumdur. Onun ayaqları və bir buynuzu sınmışdır. Başı stilləşdirilmişdir. Burulmuş buynuz salamat qalmışdır. Fiqurcuq kiçikdir, uzunluğu 2 sm, hündürlüyü 1 sm-dir.

Ağstafaçay və Mişarçay yaşayış məskənlərində aparılmış qazıntılar zamanı aşkar edilən iki qoçun fiqurcuğu məlumdur. Birinci fiqurcuqdan baş və bədən qismən salamat qalmışdır. Qulaqlar xırda yapma çıxıntılarla göstərilmişdir.

Kültəpədə tapılmış iki at fiqurcuğu xüsusi duruşludur. Onlardan birində qabaq ayaqların ucları sınmışdır. Sifəti uzun və yastıdır. Qulaqları şaqulidir. Beli azacıq əyilmiş, dal ayaqları geriyə gərilmiş, quyruğunun altında çuxur vardır. Heyvan hərəkətdə təsvir olunmuşdur. Açıq sarı gildən hazırlanmışdır, amma bişirilməmişdir.

İkinci at fiqurcuğunun başı və dal ayaqları qopmuşdur. Ola bilsin, belində yəhər təsvir edilmişdir ki, onun yalnız izi qalmışdır. Qabaq hissə çox qabarıq verilmişdir. Ayaqlar arasındakı sahə yastı və genişdir. Ön ayaqların səthi üstündə 1 sm məsafədə iki dəlik açılmışdır.



*48. Terrakota fiqurcuqları. Gil fiqurcuqlar. Qəbələ, I-III əsrlər.*

Kültəpədə, Babadərvişdə və Günəştəpədə it fiqurcuqları tapılmışdır. Başcıqları qopmuş iki it fiqurcuğu Kültəpədən nəşət edir.

Babadərvişdə aşkar edilmiş it fiqurcuğunun başı və qabaq pəncələri qoparılmışdır. Quyruq müəyyən istiqamətli çıxıntı ilə göstərilmişdir. Fiqurcuq boz gildən hazırlanmışdır, onun səthi qara rənglə örtülmüşdür. Qeyd etmək lazımdır ki, bu, Azərbaycanda qara rəngə boyanmış yeganə heyvan fiqurcuğudur.

Günəştəpədə aşkar edilmiş it fiqurcuğu çox zədələnmişdir. Başının bir hissəsi və üç ayağı sınmışdır. Fiqurcuğun başı azacıq yuxarı qaldırılmışdır. O bişirilmiş və boz rənglidir.

Mişarçay yaşayış məskənində Talış-Muğan arxeoloji ekspedisiyası tərəfindən qazıntılar aparılarkən 5,4 m dərinlikdə tapılmış quş fiqurcuğu maraqlıdır. Zahiri görkəminə görə azacıq qaldırılmış qanadlarına və açıq dimdiyinə görə o daha çox xoruzu xatırladır. Fiqurcuğun içi boşdur. Gözləri xırda nöqtələrlə göstərilmişdir. Hündürlüyü 7,5 sm-dir.

Eneolit – erkən tunc dövrü heyvanları fiqurcuqlarının yayılma sahəsi genişdir. (Ön və Orta Asiya, Cənub-Şərqi Avropa, Balkanlar). Cənubi Qafqaz yaşayış məskənlərində, Ermənistan və Gürcüstan ərazisində öküz təsvirləri üstünlük təşkil edir.

Məsələn, Ermənistanda Ariçyaşayışməskənində, Mehrablurda, Şenqavitdə, Carasvitdə və erkən tunc dövrünün bir sıra digər abidələrində ev heyvanlarını təsvir edən çoxlu gil fiqurcuq tapılmışdır. Eçmiazın yaxınlığında Kültəpədən tapılmış öküz fiqurcuqları xüsusi maraq doğurur. Onlar Naxçıvan yaxınlığın-



*49. Zoomorf heykəl. Xanlar, III-IV əsrlər.*

da Kültəpə yaşayış məskənində tapılmış fiqurlara bənzəyir. Şenqavitdə aşkar edilmiş cöngə fiqurcuqlarının əksəriyyətinin boyun nahiyəsində dəlik açılmışdır. S.A.Yesayanın fikrincə, fiqurcuqların bədənlərinin boynunda və ya digər hissələrində bu cür dəliklər təkcə öküzlərdə deyil, habelə müxtəlif heyvanları təsvir edən başqa fiqurlarda da vardır. Lakin müəllif bunların hansı heyvanlar olduğunu göstərmir. Materialların öyrənilməsi sübut edir ki, heyvanların boyunlarındakı dəlikləri yalnız öküz fiqurcuqlarında açırdılar (34.49). Marlik qəsəbəsində (Cənubi Azərbaycan) aşkar edilmiş bu cür fiqurcuqlar tamamilə birmənalı şəkildə deməyə imkan verir ki, öküzlərin boyunlarındakı dəliklər onunla bağlıdır ki, bu heyvanlar kotana qoşulmaq üçün hazırlanırdı.

Azərbaycanda erkən tunc dövrünün yaşayış məskənlərində tapılmış NƏ??? öküz təsvirlərinə bənzəyir. Bu təsvirlər Gürcüstanın Trialeti qəsəbəsində, Amiranis dağında və Gürcüstanın digər abidələrində aşkar edilmişdir. Gürcüstanın yaşayış məskənlərində tapılmış fiqurcuqlar qaramalı təsvir edir. Onların hamısı azacıq bişirilmiş, Kültəpədə aşkar edilmiş fiqurcuqlara çox bənzəyir.

Cənubi Qafqazın zoomorf fiqurcuqlarının əsas əlamətləri bunlardır: ölçüləri kiçikdir, kobud şəkildə hazırlanmışdır. Cöngələrin buynuzlarının tərtibatı aypara – mistik nişan şəklindədir. Xarakterizə edilmiş fiqurcuqlara müəyyən oxşarlığı (ən əvvəl, kiçik ölçülərdə və realistcəsinə hazırlanmaqda) Orta Asiyanın eneolit dövrünün fiqurcuqları ilə müşahidə olunur (Mollalıtəpə, Geoksür, Yalanqaçtəpə).

Urmiyə gölü yaxınlığında Göytəpə yaşayış məskənlərində öküz heykəlcikləri aşkar edilmişdir. Kültəpədə aşkar edilmiş fiqurcuqlarda olduğu kimi, bu öküz fiqurlarının boyunlarında da dəliklər vardır.

Qeyd edək ki, boynunda dəliklər olan öküz fiqurcuqları Türkiyə ərazisindəki Alişar-Huyuk yaşayış məskənində aşkar edilmiş fiqurcuqlarda da vardır.

Göründüyü kimi, öküz fiqurcuqlarının yayıldığı ərazi çox geniş olmuşdur – o, Cənubi Qafqazın, Orta Asiyanın, Kiçik Asiyanın, Balkanların, Ukraynanın və Cənub-Şərqi Avropanın bir çox qədim əkinçilik məskənlərini əhatə edirdi. Bundan əlavə, müxtəlif yerlərdə yardılmış təsvirlərdə də müəyyən oxşarlıq vardır.

Sayına görə ikinci yer ev davarını təsvir edən fiqurcuqlara məxsusdur. Azərbaycanın erkən tunc dövrünün abidələri, əsasən, qoyun və keçi fiqurları ilə təmsil olunmuşdur. Zahiri görkəminə və əlahiddə xüsusiyyətlərinə görə onlar Azərbaycanın hüdudlarından kənarlarda erkən əkinçilik məskənlərində tapılmış fiqurcuqlara bənzəyir. S.N.Bibikov öküz fiqurcuqlarının boyunlarındakı dəlikləri ayini məqsədlərlə və qurbanvermə mərasimi ilə əlaqələndirir (25.102).

Səciyyəvi haldır ki, təsvir olunan və müxtəlif yerlərdə aşkar edilmiş bütün fiqurlar bu və ya digər oxşar cizgilərə malikdir.Təsvir olunan və müxtəlif yerlərdə aşkar edilmiş fiqularda bu və ya digər oxşar cizgilərin olması səciyyəvi haldır) (xarakter daşıyır).USLUB!!! Məsələn, bu, heyvanların bədəninin və ba-

şının quruluşunda müşahidə olunur. Kobud surətdə hazırlanmasına baxmayaraq, qoyun və keçi fiqurcuqları realistcəsinə təfsir edilmişdir.

Qədim heykəltəraş hər bir heyvanın səciyyəvi xüsusiyyətlərini: qoçun burulmuş buynuzunu, keçinin saqqalını, qoyunun buynuzsuz fiqurunu və i.a. göstərməyə çalışırdı.

Bundan əlavə, çox vaxt fiqurcuqlar elə düzəldilmişdir ki, heyvanları hərəkətdə göstərir.

Beləliklə, eneolit və tunc dövrü Azərbaycanının plastikası haqqında bəzi ilkin nəticələr çıxaraq: bu zaman Azərbaycanda ilk dəfə olaraq insan və heyvan heykəlcikləri meydana çıxır. İnsan fiqurcuqları, əsasən, təsərrüfat həyatında mühüm rol oynayan qadını təsvir edir. Formasına və ikonoqrafik üslubuna görə onlar Ön və Orta Asiya heykəlciklərinə bənzəyir. Müxtəlif coğrafi regionlarda məskunlaşmış tayfaların mədəniyyətlərinin qarşılıqlı təsiri özünü göstərir.

Tunc dövrü abidələrinin terrakota heykəlcikləri, əsasən, əvvəlki heykəlciklərdən fərqlənmir. Lakin bu dövrdə kişi heykəlcikləri meydana gəlir ki, bu da cəmiyyətdə kişinin üstün rol oynaması ilə bağlıdır.

Eneolit və tunc dövrünün heyvan fiqurları, əsasən, ev heyvanlarını – öküzü, keçini, atı, iti və donuzu təsvir edir. Onlar kobud surətdə hazırlanmışdır, amma realist xarakter daşıyır. Onların hazırlanması bu heyvanların Azərbaycanın qədim əhalisinin gündəlik həyatında mühüm rol oynadığını göstərir. Onlar həmin heyvanların əhliləşdirilməsi haqqında da təsəvvür yaradır. Nəhayət, dediklərimizə yekun vurmaq olar ki, insanları və heyvanları təsvir edən terrakota heykəlciklər əkinçiliyi və maldarlığı himayə edən tanrıların müəyyən ayinləri ilə bağlıdır ki, bu barədə hazırkı tədqiqatın birinci fəslində söhbət açılmışdır.

*50. Tunc maral fiqurcuqları. Naxçıvan, Mingəçevir, Dəvəçi, e.ə. I minillik.*



Erkən dəmir dövrü Azərbaycanının abidələrindən toplanmış gil heykəllər arasında insan heykəlləri və heyvanları təsvir edən fiqurcuqlar vardır. Bu tapıntıların nisbətən azsaylı olmasına baxmayaraq, onlar dəmir dövründə də geniş yayılmış xırda plastikanın xüsusiyyətləri barəsində müəyyən fikir söyləməyə imkan verir. Onlar, əsasən, insan heykəlləri ilə, heyvan fiqurları və heykəltəraşlıq təsvirləri olan bədii keramika nümunələri ilə onların səthinə təsir göstərir.

Hazırda Azərbaycanın erkən dəmir dövrünə aid olan abidələrdən bir insan fiquru məlumdur. Bu fiqur Gədəbəy rayonunun daş yeşik tipli məzarından nəşət edir. Tapılmış insan heykəlinin hündürlüyü təqribən 1 metr olmuşdur ki, bu da alimlərin diqqətini daha çox cəlb etmişdir. Burada qeyd etmək lazımdır ki, əgər heykəlin hündürlüyü 1 metrə qədər olmuşdursa, onu bu dövrün Azərbaycan plastikası üçün nadir tapıntı hesab etmək lazımdır. Bu cür iri heykəllər daha sonrakı dövrlərdə hazırlanırdı, amma bunlar gildən deyil, daşdan yonulurdu. Gil heykəllər arasında bu cür iriölçülü heykəllər hələ aşkar edilməmişdir.

Yuxarıda xatırladılan heykəllərdən başqa, eramızdan əvvəl təqribən VI-V əsrlərə aid eilən iki heykəlcik də vardır. Onlardan biri Gəncədə tapılmış və Dövlət Tarix Muzeyində saxlanılır. Heykəlcikdən çiyinlərindən hündür olan hissə salamat qalmışdır. Başında ucu sınmış şişuclu papaq vardır. Baş geyiminin altından alnına tökülən bir çəngə tük vardır. Qalın bığları və şişuclu saqqalı vardır, gözləri iridir, badamvaridir. Heykəlciklər yaxşıca təmizlənmiş və bişirilmiş gildən hazırlanmışdır. Ölçülərinə görə salamat qalmış hissələri təqribən müəyyən etmək mümkündür ki, o, kifayət qədər iri olmuş, hündürlüyü 33–40 sm-ə çatmışdır (salamat qalmış hissənin hündürlüyü 11 sm-dir). Üzünün eni ən çox 5 sm-dir. Bu başın ilk təsviri Y.İ.Krupnov tərəfindən verilmişdir. O hesab edirdi ki, bu kişi başıdır, üzünün cizgilərinə, xüsusən, baş geyiminə və saqqalına görə skifi xatırladır (39.370–371).

*51. Tunc öküz başcıqları. Həsənlu, e.ə. XI-IX əsrlər.*



Y.İ.Krupnov təsvir olunan heykəlciyin üzünün cizgilərini və baş geyimini Kurqan Kul-Obada tapılmış elektr qabında skifin təsviri ilə müqayisə edərək, onların oxşarlığını qeyd edir. Əmircan qəsəbəsində torpaq işləri zamanı S.B.Aşurbəyli tərəfindən təsvir olunmuş və kişini əks etdirən fiqurun başı tapılmışdır. Müəllif hesab edir ki, o, skifi xatırladır.

Heykəlcik büst kimi yaradılmışdır, ahıl kişini təsvir edir. Üzünün cizgiləri realistcəsinə təsvir edilmişdir: uzun saqqal, burma bığlar, iri burun və qalın dodaqlar. Qaşları kəsmə xətlə təsvir olunmuşdur, gözləri iridir, badamvaridir. Başı yaylıqla örtülmüşdür. Əl daraqları çiyinləri yanında təsvir edilmiş, yoğun iplə belinə bağlanmış, iki qabarıq xətlə göstərilmişdir. Salamat qalmış hissənin hündürlüyü 4,5 sm, eni 2,5 sm-dir (22.394). S.B. Aşurbəylinin fikrincə, bu heykəlcik e.ə. dövrə aid edilir. Maraqlıdır ki, Y.i.Krupnovun skif təsviri hesab etdiyi kişi fiquru arasında və Bakının Əmircan kəndində tapılan fiqur arasında üzün cizgilərinin realistik təsvirində oxşarlıq vardır.Onların arasındakı yeganə fərg baş geyimlərində olan fərqdir.

Bizim fikrimizcə sifət cizgilərində bəzi oxşar xüsusiyyətlərinin olması yaxud Azərbaycan ərazisində skif mədəniyyətinin izlərinin olması bu heykəlcikləri skif təsvirləri hesab etməyə əsas vermir. Ümumiyyətlə, bu növ antropomorf təsvirlər skiflər üçün xarakterik deyil. Skif incəsənəti və kult abidələrində təqdim olunan skif allahları və dini təsviri ənənənin dəlillərinin təhlili tayfa birlikləri dövrü üçün xarakterik olan bir fenomeni nümayiş etdirir. Bu fenomen tayfa kultlarının konsolidasiyasını (birləşməsini) və "hökmdar" tayfanın allhaları başçılıq edən panteonun formalaşma prosesindən ibarət idi. Nəhayət, bu növ heykəlciklər nəinki Azərbaycan ərazisində, bütün Qafqaz ərazisində də tapılmır.

Azərbaycanda dəmir dövründə əksər hallarda ev heyvanları fiqurları tapılır, lakin onların heç biri bütöv şəkildə qalmayıb. Bu heykəlciklər əsasən öküz, at və qoç təsvirləri idi.

*52. Tunc balıq fiqurcuğu.*
*Bakı, e.ə. I minillik.*



Azərbaycanın Gədəbəy rayonunda, daş yeşik tipli məzarda öküz başı tapılıb. Öküzün buynuzlarının ucları sınıb, burun deşikləri əzik ilə göstərilib.. Öküzün ağzı ortasında olan çuxur üzlü zolaqla göstərilib.Aşaqıda dayaz altlıq var. Geniş alında üçbucaq təsvir olunub, buynuzların arasında 4,7 sm diametri olan dəlik aşılıb.

Mingəçevirdə 1947 ildə aparılan qazıntılar zamanı tapılmış kiçik öküz başı xüsusi maraq kəsb edir. Baş yaxşı bişirilib, və nazik qızıl layla örtülüb. Buynuzlar sınıb. Alnında biri birinə yanaşı üçbucaqlar təsvir olunub. Gözlər fiqurun ölçülərinə uyqun gəlməyən dairələr vasitəsi ilə göstərilib. Burnun altında kəsişən düz xəttlər var. Başın hündürlüyü – 3 sm. Hazırlanma texnikası baxımından bu fiqur Azərbaycan ərazi üçün unikal tapıntıdır.müxtəlif materiallardan, o cümlədən bürünc, qızıl və gümüşdən hazırlanmış quş və heyvan heykəlcikləri kifayət qədər tapılmasına baxmayaraq, bişirildikdən sonra qızıl ilə örtülmüş gil fiqur yalnız bir dəfə tapılıb. Eçmiadzin yaxınlığındakı Kültəpədə tapılmış öküz fiqurcuqları xüsusi maraq doğurur. Onlar Naxçıvan yaxınlığındakı Kültəpə yaşayış məskənində aşkar edilmiş fiqurların oxşarıdır. Şenqavitdə tapılmış fiqurların əksəriyyətinin boynunda dəlik açılmışdır. S.A.Yesayanın fikrincə, fiqurcuqların boynunda və ya digər hissələrində bu cür dəliklər təkcə öküz fiqurcuqlarında deyil, həm də müxtəlif heyvanları təsvir edən fiqurcuqlarda da vardır. Lakin müəllif bunların hansı heyvanlar olduğunu göstərmir. Materialların öyrənilməsi göstərir ki, yalnız öküz fiqurcuqlarının boyunlarında dəliklər açırdılar (34.49). Mərlik qəsəbəsində (Cənubi Azərbaycan) aşkar edilmiş bu cür fiqurcuqlar tamamilə birmənalı deməyə imkan verir ki, öküz fiqurlarının boyunlarında açılmış dəliklər onunla bağlı idi ki, öküzlərin fiqurları onların kotana qoşulduğu vəziyyətdə hazırlanmışdı.

Azərbaycanın erkən tunc dövrünün yaşayış məskənlərində tapılmış cöngə təsvirlərinə bənzəyən fiqurlar Trialetidə, Amiraniş-Dağda və Gürcüstanın digər abidələrində aşkar edilmişdir. Gürcüstanın yaşayış məskənlərində aşkar edilmiş fiqurcuqlar qaramalı təsvir edir. Onların hamısı zəif bişirilmişdir, Kültəpədə tapılmış cöngə fiqurcuqlarına çox bənzəyir.



*53. Tunc quş fiqurcuğu. Çovdar, e.ə. I minillik.*

Cənubi Qafqazın zoomorf fiqurcuqlarının əsas cizgiləri bunlardır: kiçik ölçüləri, qaba hazırlanması. Cöngələrin buynuzlarını aypara-ulduz nişanı şəklində düzəldirdilər.

Xarakterizə edilmiş fiqurcuqlarla (hər şeydən əvvəl, kiçik ölçülü və realist üslubda hazırlanmış fiqurcuqlarla, yəni Orta Asiyanın eneolit dövrünün Göytəpə

yaşayış məskənlərinin müəyyən qatlarında da aşkar edilmişdir. Göytəpədə aşkar edilmiş fiqurcuqlarda olduğu kimi, bu öküzlərin fiqurcuqlarının boyunlarında dəliklər açılmışdır Mollalıtəpə, Geoksür, Yalanqaçtəpə fiqurcuqları ilə) müəyyən oxşarlıq müşahidə olunur.

Öküz heykəlcikləri Urmiyə gölü yaxınlığında.

Qeyd edək ki, boyunlarında dəliklər açılmış öküz fiqurcuqları Türkiyə ərazisindəki Əlişər-Huyuk yaşayış məskənindən də məlumdur.

Göründüyü kimi, bu fiqurcuqların yayıldığı ərazi çox geniş idi. O, Cənubi Qafqazın, Orta Asiyanın, Kiçik Asiyanın, Balkanların, Ukraynanın və Cənub-Şərqi Avropanın bir çox qədim əkinçilik məskənlərini əhatə edirdi. Bundan əlavə, müxtəlif yerlərdən olan təsvirlər bir-birinə müəyyən dərəcədə oxşar olduğunu büruzə verir.

Sayına görə ikinci yeri ev davarını təsvir edən fiqurcuqlar tutur. Azərbaycanın erkən tunc dövrünün abidələrindən onlar, əsasən, qoç və keçi fiqurları ilə təmsil edilmişdir. Zahiri görkəminə və ayrı-ayrı xüsusiyyətlərinə görə onların. Azərbaycanın hüdudlarından kənarda erkən əkinçilik məskənlərində tapılmış fiqurcuqlarla oxşarlığı vardır.

S.N.Bibikov öküz fiqurcuqlarının boyunlarındakı dəlikləri mərasimi məqsədlərlə və qurbanvermə ayini ilə əlaqələndirir (25.102).

Qədim heykəltəraş hər bir heyvanın səciyyəvi xüsusiyyətlərini Səciyyəvi haldır ki, təsvir edilən, müxtəlif yerlərdə tapılmış bütün heyvan fiqurcuqları bu və ya digər oxşar cizgilərə malikdir. Məsələn, bu, bədənin və başın quruluşunda müşahidə olunur. Kobud şəkildə hazırlanmasına baxmayaraq, qoç və keçi fiqurcuqları realistcəsinə təfsir edilmişdir: qoçun əyilmiş buynuzunu,



*54. Terrakota heykəli. Qızılvəng, Naxçıvan, III-VII əsrlər.*

keçinin saqqalını, qoyunun buynuzsuz fiqurcuğunu və i.a. göstərməyə çalışmışdır. Bundan başqa, çox vaxt fiqurcuqlar elə düzəldilmişdir ki, heyvanları hərəkətdə göstərir

Beləliklə, eneolit və tunc dövrü Azərbaycanının plastikası haqqında bəzi ilkin nəticələr çıxaraq. Bu zaman Azərbaycanda ilk dəfə insanın və heyvanların heykəlcikləri meydana gəlir. İnsan fiqurcuqları, əsasən, təsərrüfat həyatında mühüm rol oynayan qadını təsvir edir. Formasına və ikonoqrafik üslubuna görə onlar Ön və Orta Asiya heykəlciklərinə bənzəyir. Beləliklə, müxtəlif coğrafi regionlarda məskunlaşmış tayfaların mədəniyyətlərinin qarşılıqlı təsiri özünü göstərir.

Tunc dövrü abidələrinin terrakota heykəlcikləri, əsasən, əvvəlki heykəlciklərdən fərqlənmir. Lakin bu dövrdə kişi heykəlcikləri peyda olur ki, bu da cəmiyyətdə kişinin rolunun üstünlük təşkil etməsi ilə əlaqədardır.

Eneolit və tunc dövrü heyvanlarının fiqurları, əsasən, ev heyvanlarını – öküzü, keçini, atı, iti və donuzu təsvir edir. Onlar kobud şəkildə, lakin realistcəsinə hazırlanmışdır. Onların hazırlanması Azərbaycanın qədim əhalisinin gündəlik həyatında bu heyvanların mühüm rol oynadıqlarını göstərir. Onlar həmçinin həmin heyvanların əhliləşdirilməsi haqqında təsəvvür yaradır.

Nəhayət, belə bir nəticə çıxarımaq olar ki, insanı və heyvanları təsvir edən terrakota heykəlcikləri əkinçiliyə və maldarlığa himayədarlıq edən tanrıların müəyyən ayinləri ilə bağlıdır ki, hazırkı tədqiqatın birinci fəslində bu barədə söhbət açılmışdır.

Erkən dəmir dövrü, Azərbaycanının abidələrindən toplanmış gil heykəllər arasında insan heykəlcikləri və heyvanları təsvir edən fiqurcuqlar vardır. Bu tapıntıların nisbətən azsaylı olmasına baxmayaraq, onlar dəmir dövründə də geniş yayılmış xırda plastika sənətinin xüsusiyyətləri barəsində-haqqında müəyyən rəy söyləməyə imkan verir. Onlar, əsasən, insan heykəlcikləri, heyvan fiqurcuqları və onların səthində insanın, heyvanların heykəltəraşlıq təsvirləri ilə bədii keramika nümunələri ilə təmsil edilmişdir.

Hazırda erkən dəmir dövrünə aid olan Azərbaycan abidələrindən bir insan heykəlciyi məlumdur. O, Gədəbəy rayonunun daş yeşik tipli basdırma üsulundan nəşət edir. İnsan heykəlinin hündürlüyü 1 m-ə yaxın olmuşdur ki, bu da alimlərin diqqətini daha çox cəlb etmişdir. Burada qeyd etmək lazımdır ki, insan heykəlinin hündürlüyü 1 m-ə qədər olmuşdur. Onu həmin dövrün Azərbaycan plastikası üçün nadir tapıntı hesab etmək lazımdır. Bu cür iri heykəllər daha sonrakı dövrlərdə hazırlanırdı, lakin gildən deyil, daşdan istehsal olunurdu. Gil heykəllər arasında belə iriölçülü heykəl hələlik tapılmamışdır.

Yuxarıda göstərilənlərdən əlavə, daha iki heykəlcik vardır ki, bunlar təqribən eramızdan əvvəl VI-V əsrlərə aid edilir. Onlardan biri Gəncədə tapılmış və Dövlət Tarix Muzeyində saxlanılır. Heykəlciklərdə çiyinlərdən yuxarı hissə salamat qalmışdır. Heykəlciyin başında ucu sınmış şişuclu papaq vardır. Onun alnında baş geyiminin altından tökülmüş tük çəngələri görünür. Qalın



*55. Terrakota fiqurcuğu. Xınıslı, Şamaxı, I-II əsrlər.*

bığları və şişuclu saqqalı vardır, gözləri iridir, badamvaridir. Heykəlcik yaxşı təmizlənmiş və bişirilmiş gildən hazırlanmışdır. Ölçüsünə görə salamat qalmış hissəni təxminən belə müəyyən etmək olar ki, o kifayət qədər iri, 33–40 sm hündürlüyündə olmuşdur (salamat qalmış hissənin hündürlüyü 11 sm-dir). Üzün ən böyük eni 5 sm-dir. Bu başın ilk təsviri Y.İ.Krupnov tərəfindən verilmişdir. O hesab edirdi ki, bu baş kişini təsvir edir, üzünün cizgiləri, xüsusən baş geyimi, saqqalı ilə skifi xatırladır (39, 370–371).

Y.İ.Krupnov təsvir olunan heykəlciyin üzünün və baş geyiminin bəzi cizgilərini Kurqan Kul-Obadan tapılmış elektro qabının üzərindəki skif təsvirini qabın üzərindəki skif təsviri ilə müqayisə edir. Əmircan qəsəbəsində torpaq işləri zamanı kişinin təsvirini verən, S.B.Aşurbəyli tərəfindən təsvir olunmuş fiqurun başçığı tapılmışdır. Müəllif hesab edir ki, o, skifi xatırladır.

Büst şəklində düzəldilmiş heykəlcik ahıl kişini təsvir edir. Üzünün cizgiləri realistcəsinə verilmişdir: uzun saqqal, burma bığlar, iri burun və qalın dodaqlar. Qaşları kəsik xətlə göstərilmiş, gözləri iri və badamvaridir. Başı başlıqla örtülmüşdür, əllərinin daraqları çiyinləri bərabərində təsvir edilmiş, iplə belinə sarınmış, iki qabarıq xətlə göstərilmişdir. Heykəlciyin salamat qalmış hissəsinin hündürlüyü 4,5 sm, eni 2,5 sm-dir (22.394).

S.B.Aşurbəyliyə görə, bu heykəlcik eramızdan əvvəlki dövrə aiddir. Maraqlı burasıdır ki, Y.İ.Krupnovun skifin təsviri hesab etdiyi kişi fiquru ilə Əmircanda aşkar edilmiş fiqurcuq arasında oxşarlıq vardır, hər şeydən əvvəl, üzün cizgilərinin realistcəsinə təsvirində. Onların arasında yeganə fərq baş geyimlərindədir.

Bizə belə gəlir ki, üzün bəzi cizgilərinə görə oxşarlıq və ya Azərbaycan ərazisində skif mədəniyyəti izlərinin olması bu heykəlcikləri skiflərin təsviri hesab etməyə əsas vermir. Əvvələn, belə tipli antropomorf təsvirlər skiflər üçün səciyyəvi deyildir. Skif tanrıları haqqında və dini xarakterli təsviri ənənələr haqqında şəhadətlərin nəzərdən keçirilməsi skif incəsənəti və ayini abidələrdə təqdim olunmuş bu ənənə tayfa birlikləri dövrünün skif dini üçün səciyyəvidir, qəbilə-tayfa kultlarının sıx birləşməsi prosesi və panteonun ayrılması hadisəsidir; panteonda “çar” tayfasının tanrıları başçıdırlar. İkincisi, təkcə Azərbaycan ərazisində deyil, habelə bütün Cənubi Qafqaz ərazisində bu cür heykəlciklərə rast gəlinməmişdir.

Daş dövrü dövründə Azərbaycanda heyvan fiqurcuqlarına daha çox rast gəlinir, hərçənd bütünlüklə salamat qalmış heç bir fiqurcuq yoxdur. Bunlar ev heyvanlarının, əsasən, öküz, at və qoyunun təsvirləridir.

Gədəbəy rayonundakı daş yeşik tipli qəbirdə öküz başı tapılmışdır. Onun buynuzlarının ucları sınmış, burun pərəkləri batıqlarla göstərilmişdir. Ortasında kiçik çuxur olan tilli zolaqla işarə edilmişdir, aşağıda yastı dibi vardır. Geniş alnında üçbucaq təsvir edilmiş, buynuzlar arasında diametri 4,7 sm olan dəlik açılmışdır. 1947-ci ildə Mingəçevirdə qazıntılar zamanı aşkar edilmiş xırda öküz başı xüsusi maraq doğurur. O yaxşı bişirilmiş və nazik qızılı yarpaqla örtülmüşdür. Buynuzları sınmışdır. Alnında bir-birinə toxunan üçbucaqlar təsvir edilmişdir. Gözləri fiqurcuğun ölçülərinə uyğun gəlməyən dairələr şəklində verilmişdir. Burnu üstündə bir-biri ilə kəsişən düz xətlər cızılmışdır. Başın hündürlüyü 3 sm, eni 2 sm-dir. Hazırlanma texnikasına görə Azərbaycan ərazisində bu fiqur nadirdir. Müxtəlif materiallardan hazırlanmış heyvan və quş fiqurcuqları, o cümlədən tuncdan, gümüşdən və qızıldan düzəldilmiş fiqurcuqlara tez-tez rast gəlinir, amma gil fiqur bişirildikdən sonra qızılı yarpaqla örtülmüş, yalnız bir dəfə aşkar edilmişdir. Heyvanların gil fiqurcuqları arasında qoç fiqurcuqları xüsusi yer tutur. Eneolit və tunc dövrlərindən fərqli olaraq dəmir dövründə bütöv qoç fiqurcuqlarına rast gəlinmir. Göründüyü kimi, Şərq ölkələri incəsənətində yeni istiqamət – bütöv fiqur əvəzinə onun bir hissəsinin təsviri meydana gəlmişdir. Bir sıra ölkələrin xalqları ilə mədəni-iqtisadi əlaqələr saxlayan qədim Azərbaycan bu istiqamətdən kənarda qala bilməzdi.

*56. Tunc insan fiqurcuğu. İbrahim-Hacılı, Tovuz, e.ə. I minillik.*



Azərbaycan tarixində dəmir dövründən sonra gələn dövr Albaniya dövrü adlanır. Bu zaman Azərbaycan əhalisinin həyatında baş vermiş mühüm dəyişikliklər istər yazılı mənbələrdə, istərsə də çoxsaylı heykəltəraşlıq abidələrində əks olunmuşdur.

Bu dövrün aşkar edilmiş abidələri həmin mədəniyyətdə iki xronoloji dövrü müəyyən etməyə imkan verir: eramızdan əvvəl VI-V əsrlər və eramızdan əvvəl I əsr – eramızın III əsri. Bu zaman incəsənətdə qədim ənənələr əsasında incəsənətdə innovasiyalar meydana gəlir, yerli incəsənət təkmilləşir, plastika sənəti inkişaf edir. N.İ.Rzayev Qafqaz Albaniyası ərazisində tapılmış plastika əsərlərini sistemləşdirərək, onları heykəllərə və qəbirüstü abidələrə ayırır (57.172).

Plastika sənəti əvvəlki dövrlərlə müqayisədə daha geniş ərazidə yayılır. Albaniya dövründə İsmayıllı, Şamaxı, Mingəçevir, Qəbələ, Göyçay və bir sıra digər

rayonların əhalisi gildən və başqa materiallardan ayin mərasimlərinin icrası üçün insan heykəlcikləri və heyvan fiqurları hazırlayırdı.

Bu dövrün plastika nümunələri N.İ.Rzayevin, T.İ.Qolubkinanın və başqa müəlliflərin tədqiqatlarında əks olunmuşdur. İnsan heykəlciklərinə və heyvan fiqurcuqlarına bu və ya digər dərəcədə bir sıra başqa alimlər də toxunmuşlar. Lakin bu tapıntıların təsnifatı, onların hazırlanmasının məqsədləri, eləcə də bir sıra digər məsələlər hələ bütünlüklə işıqlandırılmamışdır. Tədqiq olunan plastika əsərləri hazırlanma texnikasına, forma müxtəlifliyinə və bəzək məişət əşyalarının üslub xüsusiyyətlərinə görə son dərəcə fərqlənir. Buna görə də ayrıca olaraq hər biri üzərində ətraflı dayanaq.

Mingəçevirdə qazıntılar zamanı xeyli miqdarda heykəlcik toplanmışdır. Onların hərtərəfli tədqiqi müxtəlif tarixi dövrlərdə cəmiyyətin həyatında baş verən sosial-iqtisadi və mədəni dəyişikliklər haqqında mühakimə yürütməyə imkan verir. Mingəçevirdə aşkar edilmiş heykəlciklər formasına, üslubuna və tapıntıların şəraitinə görə əhəmiyyətli dərəcədə fərqlənir. İnsan heykəlcikləri, əsasən, küp-qəbirlərdən dulusçuluq məmulatı bişirilən sobalardan və köçəbələrdən nəşət edir.

*57. Tunc fiqurcuq. Əmircan, Bakı, Antik dövr.*



Qadın heykəlciklərindən biri küp-qəbirdən nəşət edir, onun başı, əlləri və ayaqları qopmuşdur. İncə beli, qabarıq döşləri və iri ombaları aydın göstərilmişdir. Beli bir tərəfdən qurşaqla sarınmışdır. Boynunu spiralabənxər şəkildə yerləşmiş 10 cərgə yapma həmail bəzəyir. Çiyinlərindən döşlərinin üstünə sallanan iki sap bəzək-məişət əşyaları naxışlarla müzəyyəndir. Döşlərarası nahiyədən qarnının üstünə, ehtimal ki, sinəbəndə işarə edən "Л" hərfi formasında yapma bəzək əşyası sallanır. Qarının aşağı hissəsində, qasıq nahiyəsində yapma nöqtələrlə dairə əmələ gətirilmişdir. Cinsiyyət orqanının rəmzi təsviri onu günəşə bənzətməyə vadar edir. Qadının cinsiyyət orqanının və günəşin belə açıqca paraleli ideoloji təsəvvürlərdən irəli gəlir ki, həmin təsəvvürlərdə bu hər ikisi başlanğıc həyatın yaranması, onun məhsuldarlığı ilə bağlıdır. Əllərin qalıqlarına əsasən güman etmək olar ki, əllər açılmış halda imiş.

Küp-qəbirdə aşkar edilmiş başqa bir heykəlcikdə də baş, ayaqlar və əllər qırılmışdır. Bədənin sağ qalmış hissəsində ombalardan və qarından keçən nöqtəli xətlərin izləri nəzərə çarpır. Burada da biz İlahə-Ana fiqurcuğunda məhsuldarlığın artırılması ayininin icrası

ilə qarşılaşırıq. Göbək və cinsiyyət orqanı dairəciklərlə göstərilmişdir. Heykəlciyin beli incədir, ombaları çox genişdir.

Başqa bir küp-qəbirdə tapılmış qadın heykəlciyi Mingəçevirdə aşkar edilmiş bütün heykəlciklərdən onların hazırlanması üsulu ilə fərqlənir. Fiqurcuq qadın büstü şəklində yapılmışdır: ayaqları əvəzinə yastı oturacaq verilmişdir. Başı və əlləri qırılmışdır. Uzun boynu yapma zolaqların üç cərgəsi ilə bəzədilmişdir, ehtimal ki, bu zolaqlar həmailə işarədir. Döşləri kiçik çıxıntılar şəklində verilmişdir. Əllərin salamat qalmış fraqmentlərinə əsasən müəyyən etmək olar ki, əllər irəliyə doğru uzadılmışdı. Döş səviyyəsində hər çiyinə xırda nöqtələr yapışdırılmışdır.

Küp-qəbirdə aşkar edilmiş kişi heykəlciyində ayaqlar və əllər sınmışdır. Əl və ayaqların qalıqlarına əsasən müəyyən etmək olar ki, insan əlləri yuxarı qaldırılmış vəziyyətdə (dua pozası), ayaq üstə təsvir edilmişdir. Başı stilləşdirilmişdir – onu boynunun ətrafına sarılmış sarığı təsvir edir. Çiyinlərində yapma bəzək əşyası vardır. Xarici görkəminin bəzi əlamətləri müəyyən etməyə imkan verir ki, bu, kişi təsviridir.

Qadın heykəlciyi. Ayaqları və əlləri qırılmışdır. Başı qarmaqvari çıxıntı ilə göstərilmişdir. Uzun boynu bir tərəfdən iki cərgə həmaillərlə bəzədilmişdir. Döşləri, göbəyi və cinsiyyət orqanı xırda çökəkli nöqtələrlə göstərilmişdir. Beli navalça sarınmışdır ki, bu da onun incəliyini nəzərə çarpdırır. Mingəçevirdə tapılmış digər heykəlciklərlə müqayisədə bu heykəlcik kobud şəkildə hazırlanması ilə fərqlənir.

Analoji heykəlcikdə də yalnız onun bədəni salamat qalmışdır. Əlləri və qurşaqdan aşağı bədəninin bir hissəsi qırılmışdır. Bədəni ilə müqayisədə uzun boynu nöqtələrlə naxışlanmış iki cərgə yapma bəzək-məişət əşyaları ilə müzəyyəndir. Çox iri döşlərindən biri salamat qalmışdır.

Daha iki heykəlcik büst şəklində hazırlanmışdır. Onların birincisində ovalşəkilli, çox uzun boynu vardır. Əvvəlkilərdən fərqli olaraq, onun əlləri bədənin yanlarında proporsional xətlərlə göstərilmişdir. Boynu həmayili təsvir edən 13 spiralşəkilli yapma zolaqla bəzədilmişdir. Başı boynun axırında xırda çıxıntı ilə göstərilmişdir. Üzü yastıdır, gözləri iki çökəkli nöqtə göstərilmişdir.

Küp-qəbirlərdə aşkar edilmiş qadın heykəlciklərindən biri sxematik hazırlanmışdır. Başı və əlləri kiçik çıxıntılarla verilmişdir. Döşləri xırdadır. Boynunun axırında gil sarğı yapışdırılmışdır. Beli incədir, sarğı ilə əhatə edilmişdir. Ayaqları tamamilə sınmışdır.

Daha bir fiqurcuğun başı, əlləri və sağ ayağı sınmışdır. İncə beli enli qurşaqla əhatə olunmuşdur. Çiyinləri enində döşləri və ombaları vardır. Boynu bədəni ilə müqayisədə çox uzundur, Yapma bəzək-məişət əşyaları cərgələrilə bəzədilmişdir. Boynunun sağ qalmış hissəsində xırda nöqtələrin izləri vardır, ehtimal ki, bunlar muncuqlara işarədir. Bişirilərkən boz rəng almışdır, sonra isə ağ anqobla örtülmüşdür. Beli incədir, qurşaqdan aşağı olan hissəsi qabarıq verilmişdir.

Növbəti heykəlcik əvvəlkilərlə müqayisədə pis qalmamışdır. Hərçənd başı və sol əli sınmışdır, ilkin formasını müəyyən etmək mümkündür. Döşləri və ombaları qabarıq verilmişdir. Ayaqları çiyinləri enində aralı verilmiş, əlləri bədənə perpendikulyar yanınca uzadılmışdır. Heç bir bəzək-məişət əşyası yoxdur.

Başqa bir heykəlciyin başında dörd cərgə hörük, gicgahlarında çəngə-çəngə saç var, onların arxasında dəlik açılmışdır. Başında sarğı, boynunda altı cərgə yapma bəzək-məişət əşyaları vardır.

Növbəti heykəlcik bir qədər içəri salınmış yastı oturacaqlı büst şəklində hazırlanmışdır. Əllərin əvəzinə yanlarına spiralşəkilli çıxıntılar yapışdırılmışdır. Arxa tərəfdən bədənin ortasına qədər çəngə-çəngə saçlar sallanmışdır, onlar nöqtələrlə bəzədilmişdir. Heykəlcik bişirilərkən boz rəng almış və ağ gil məhlulu ilə örtülmüşdür.

Sol tərəfi bütünlüklə qırılmış kişi fiqurunu təsvir edən heykəlcik də vardır. Boynu və sağ əli yapma gil çubuqlarla əhatə edilmişdir ki, bunlar boynunda çarpazlaşır, əllərinin üstündə isə paralel yerləşmişdir. Belində enli qurşaq təsvir edilmiş, onlar qabaq və arxa tərəfdən sınmışdır.

Kişini təsvir edən digər heykəlciyin yalnız başı salamat qalmış, onun yuxarı hissəsi sınmışdır. Başının ətrafında şaquli oyma xətlərlə saçları əks etdirilmiş, arxa tərəfdə saçları aşağı sallanmışdır. Qulaqları çökəklərlə verilmiş, qaşları və burnunun üst hissəsi bir qədər qabarıqdır, alnı mailidir. Gözləri simmetrik yerləşmiş çökəklərlə təsvir edilmişdir. Üzü və burnu uzadılmışdır, ağzı dəyirmi çökəklə verilmişdir. Bir qədər uzadılmış çənəsi dəyirmiləşərək çökəklə işarə edilmişdir. Boynunda yapma zolaqların izləri qalmışdır.

Qədim Şamaxıda tapılmış heykəlciklər arasında qadın təsvirləri də vardır. Onlar müxtəlif ölçülüdür, formalarına, hazırlanması texnikasına və xarici görkəminə görə fərqlənir.

Terrakotadan hazırlanmış qadın heykəlcikləri antik Qəbələdən məlumdur. Şamalı kəndində tapılmış qadın heykəlciyi böyük maraq doğurur. Onun başı, əlləri və ayaqları qırılmışdır, amma onların qalıqlarına əsasən heykəlciyin ilkin görkəmini müəyyən etmək mümkündür. Döşləri qabarıqdır, beli incədir və ombaları enlidir. Boynunda həmailəbənzər bəzək-məişət əşyası vardır. Salamat qalmış hissənin hündürlüyü 11 sm-dir. Ombalarının eni 8,5 sm, belinin ölçüsü 6,5 sm, boynunun diametri 4 sm, qabarıq döşləri arasında məsafə 2,5 sm-dir. Digər tapıntılarla birlikdə bu heykəlcik təqribən eramızdan əvvəl I əsrə – eramızın I əsrinə aiddir.

İkinci heykəlcik 1974-cü ildə Qəbələdə tapılmışdır. Heykəlcik yaxşı qalmamışdır, başı, ayaqları və əlləri axıra qədər qırılmışdır. İncə beli və döşləri vardır, çıxıntılarla təsvir edilmişdir. Heykəlciyin salamat qalmış hissəsinin hündürlüyü 5,5 sm, çiyinlərinin eni 4 sm-dir.

1978-ci ildə Qəbələdə tapılmış başqa bir heykəlciyin yalnız bədəni salamat qalmışdır, bir ayağı tamamilə sınmış, digər ayağının yarısı qalmışdır. Beli

yapma qurşaqla əhatə olunmuş, arxa tərəfdən qopmuş, xırda dairəciklərlə və qabarıq nöqtələrlə bəzədilmişdir ki, bu da metal kəmərin imitasiyasıdır. Qabaq tərəfdə qadın cinsiyyət orqanı təsvir edilmişdir.

Son illərdə qədim Qəbələdə aparılmış qazıntılar zamanı daha iki terrakota heykəlcik aşkar edilmişdir. Birincisi qadın heykəlinin başı ilə təsvir olunmuşdur. Maraqlı burasıdır ki, heykəlcikdə zoomorf cizgilər nəzərə çarpır. İkinci heykəlcik çılpaq qadının təsvirindən ibarətdir. Onun əlləri, ayaqları və başı qopmuşdur. Döşləri çox qabarıq verilmişdir. Boynunda on bir cərgə həmail vardır. Ombaları enlidir, beli incədir. Hər iki heykəlcik eramızdan əvvəl I əsrin sonuna – eramızın I əsrinə aiddir.

Göyçay rayonunun ərazisində təsadüfən tapılmış maddi mədəniyyət nümunələri arasında insanın gil heykəlcikləri də vardır. Onlardan ikisi Azərbaycan Elmlər Akademiyası Tarix institutunun arxeoloji fondundadır.

Heykəlciklərdən biri qadını təsvir edir. Başı, əlləri və bədənin beldən aşağı hissəsi qırılmışdır. İri döşləri və incə belində yapma bəzək əşyaları qabarıq formaya malikdir. Lentvari yapma bəzək əşyaları boyundan başlayaraq çiyinlər səviyyəsinədək enir. Boyun həmaillə bəzədilmiş, döşlər arasında isə asma bəzək əşyası vardır. Heykəlcik heç bir qarışığı olmayan yüksək keyfiyyətli gildən hazırlanmışdır.

İkinci qadın heykəlciyi çox pis hifz olunmuşdur: bütövlükdə sağ tərəfi, başı, əlləri və ayaqları qopmuşdur. Kobud şəkildə düzəldilmişdir. Birincidən fərqli olaraq, bəzək əşyaları yoxdur. Döşləri iridir, qabarıqdır. Qabaq tərəfdən səthi hamarlanmışdır, arxa tərəfdən kobud şəkildə saxlanmışdır.

İsmayıllı rayonunda Molla-İsaqlı kəndi yaxınlığında çoxlu miqdarda gil qadın heykəlciyi aşkar edilmişdir. Burada tapılmış bütün fiqurlar çılpaq qadınları təsvir edir. Bu fiqurcuqların ideoloji məzmununun kökləri məhsuldarlıq və məhsuldarlığın özünün rəmzi olan İlahə-Ananın qədim ayininə gedib çıxır. Demək olar, bütün fiqurcuqlar yaşayış məskənlərinin xarabalıqlarında aşkar edilmişdir. Fiqurcuqlar ocağın yerləşdiyi rayonda daha tez-tez aşkar edilirdi ki, bu da ocağın və məhsuldarlığın mühafizi kimi onların ecazkar əhəmiyyətini bir daha təsdiq edir. Burada xatırlatmaq yerinə düşər ki, ocaq azərbaycanlıların əcdadlarının evində həmişə ən müqəddəs yer olmuşdur.

Mənzilin kandarı yanında basdırılmış çoxlu belə fiqurcuq aşkar edilmişdir ki, bu da evin hüdudunda məhsuldarlığı və ruzini qoruyub saxlamaq arzusu ilə izah olunur.

Bütün bu fiqurcuqlar çox kiçik ölçülüdür (hündürlüyü 12 sm-dən artıq deyildir), bişirilmiş gildən hazırlanmışdır və çox vaxt öz üzərində məhsuldarlığın və bolluğun artırılmasının sehrli mərasiminin güclü təsirinin izlərini daşıyır. Döşlər, qarın və ombalar nahiyəsində nöqtəvari dəliklər və yapmalar deyilənləri təsvdiq edir. Tədqiqatçı N.Rzayev hesab edirdi ki, bu yapmalar apotropik (qoruyucu – ithaf) əhəmiyyətə malik ola bilərdi.

Molla-İsaqlı fiqurlarının formal xassələrinin təhlili bunu söyləməyə imkan verir ki, burada qadın obrazı ilə əlaqədar olan iki ayin yayılmışdı: birinci ayin məhsuldarlıq və ruzi bəxş edən, onları qoruyub saxlayan ana ilə bağlıdır, ikincisi isə oyanan məhsuldarlığın, yəni məhsuldarlıq potensiyasının rəmzi olan qız ayini ilə bağlıdır. Buradan belə bir nəticə çıxır ki, heykəllərin qadını və qızı təsvir edən iki tipii vardır.

Yetkin qadınların obrazları iri ombalar və yekə döşləri olan qadınların heykəlcikləri ilə təmsil edilmişdir. Qız heykəlcikləri incə beli olan zərif qızları təsvir edir.

Demək lazımdır ki, Molla-İsaqlıda aşkar edilmiş qadın fiqurcuqlarının böyük əksəriyyətinin ayaqları, əlləri və başları yoxdur. Bu hadisə artıq uzun müddətdir ki, elmi diskussiyalar mövzusudur, bunların arasında belə bir rəy üstünlük təşkil edir ki, fiqurcuqların bu hissələri məhsuldarlığın artırılmasına və qorunub saxlanmasına sehrli ayinin icrası nəticəsində sınmışdır. Mövcud nöqteyi-nəzərə görə, ayin başa çatdıqdan sonra fiqurcuqların əlləi və ayaqları o səbəbdən sındırılırdı ki, məhsuldarlıq evi tərk etməsin (S.Nəzirova). Bizə belə gəlir ki, bu fenomenin sadə izahı vardır: fiqurların ən çox qabağa çıxan hissələri sınmışdır ki, bu da onların zəif bişirilməsi (ev ocağında), hamısının tapıldığı çökmüş torpağın təzyiqi ilə izah edilir. Yeri gəlmişkən, demək lazımdır ki, Azərbaycanda (məsələn, Şəkidə) bütöv fiqurcuqlar aşkar edilmişdir.

Burada, Molla-İsaqlıda isə mənzillərdən birində fiqurcuğun ayrıca başı aşkar edilmişdir. Zənnimizcə, bu ayin fiqurcuqlarının şikəst edilməsi onların yaratmış insana qarşı hörmətsizlik olardı.

Fiqurcuqların plastik xassələri onu göstərir ki, bunların hamısı üslublaşdırılmış manerada düzəldilmişdir ki, onun üçün plastika və proporsiyalar realizmi son dərəcə şərti olmuşdur. Onların formal-plastik göstəricilərindən məlum olur ki, bu fiqurcuqların düzəldilməsinin nə isə bir qanunu mövcud olmuşdur, bu isə həmin region üçün səciyyəvidir. Qəbələdə, Molla-İsaqlıda, Fuzuli rayonunda, Şəki – Zaqatala zonasında aşkar edilmiş fiqurların yapılması qanunlarının müqayisəli olduğunu da göstərir.

Qusar rayonunun Bədirqala kəndində yapma bəzək-məişət əşyaları olan büst formasında bir qadın heykəlciyi tapılmışdır.

Cənubi Azərbaycanda – Mərlik qəsəbəsində həm kişiləri, həm də qadınları təsvir edən xeyli miqdarda xırda antropomorf plastika nümunələri tapılmışdır (77.128–133). Eramızdan əvvəl 11–10-cu əsrlərin məzarlıqlarında aşkar edilmiş heykəllər dəfnetmə və qurbanvermə mərasimi ilə bağlıdır. Mərlik fiqurcuqları həmçinin çılpaq kişiləri və qadınları təsvir edir. Fərq yalnız orasındadır ki, kişi heykəlciklərinin qurşaqlarında silah təsvirləri (məsələn, xəncərlər) vardır. Mərlik fiqurcuqlarının cinsi əlaməti hipertroflaşdırmış cinsi orqanla nəzərə çarpdırılır. Fiqurcuqların portret xarakteristikaları yerli-dibli yoxdur, burada biz mücərrəd obrazlarla – axirət dünyasında həyatın davam etdirilməsini təmin edən kişi və qadın başlanğıcının simvolları ilə qarşılaşırıq.

Cənubi Azərbaycanda çılpaq qadınların gil heykəlcikləri də aşkar edilmişdir; bunlar da, Şimali Azərbaycanda olduğu kimi, məhsuldarlıq ayini ilə bağlıdır (İlahə-Ana). Rəvandüz yaxınlığındakı Amlaş qəsəbəsində aşkar edilmiş qadın fiqurcuğu bu cür heykəlin orijinal nümunəsidir. Bu fiqurcuğun tipoloji cizgiləri onun Şimali Azərbaycandakı analoqlarının eynidir, fərqlər fiqurcuğun plastik qəlibinə aiddir, orada monumentallaşdırıcı əlamətlər göz qabağındadır. Buna baxmayaraq, oranın ustaları öz fiqurcuqlarının sifətinə, saç düzümünə və aksessuarlarına böyük diqqət yetirmişlər. Bu heykəlin düzəldilməsi üçün əsas götürülmüş bədii qanun öz kökləri ilə məhsuldarlıq ilahəsinin şumer obrazlarına aparıb çıxarır, bununla yanaşı, qadının yerli antropoloji tipidir.

Cənubi Azərbaycan və Şimali Azərbaycan heykəlləri arasında analogiyanı Mərlikdən tapılmış kişi heykəlciyinin və İbrahim-Hacılı kəndində (Tovuz rayonu) tapılmış fiqurcuğun timsalında izləmək mümkündür. Burada da fiqurcuq gec dəmir dövrünə aid edilir və biz həmçinin qabağa uzadılmış əlləri və kişi kultunun mövcud olduğuna dəlalət edən hipertroflaşdırılmış fallosu olan kişi təsviri ilə qarşılaşırıq.

Albaniya dövrü Azərbaycanının abidələrindən Mingəçevirdə, Şamaxıda, İsmayıllıda, Qəbələdə və başqa yerlərdə aşkar edilmiş insan heykəlciklərinin tapıldığı elə həmin ərazidə yayılmış heyvanları təsvir edən xeyli miqdarda gil fiqur nəşət edir. Fiqurcuqların əksəriyyətini isə Mingəçevirin öyrənilən dövrə aid olan mədəni təbəqəsində aşkar edilmişdir.

1952-ci ildə №3 yaşayış məskənində tapılmış heyvan fiqurcuğu çox kobud şəkildə hazırlanmışdır. Onun başı, quyruğu və bir ayağı qopmuşdur. Xarici



*58. Terrakota fiqurcuqları. Molla-İsaqlı, İsmayıllı, I-III əsrlər.*

görkəminə görə iti xatırladır. 1950-ci ildə keçi fiqurcuğu tapılmışdır. Fiqurcuğun dal ayaqları və bir qabaq ayağı qopmuşdur. Buynuzu kiçik çıxıntılarla göstərilmiş, quyruğu azacıq yuxarı qaldırılmışdır. Qoç fiqurcuğu 1956-cı ildə 1,55 m dərinlikdə tapılmışdır. Fiqurcuğun quyruğu, dal ayaqları və buynuzu qopmuşdur. 1952-ci ildə №2 yaşayış məskənində 2,2 m dərinlikdə heyvan fiqurcuğu tapılmışdır. Fiqurcuğun başı və arxa hissəsi qopmuşdur. Yalnız bir qabaq ayağı hifz olunmuşdur. Bədəni uzun və qeyri-proporsionaldır. Xarici görkəminə görə vəhşi qabanı xatırladır. Gilin rəngi bozumtuldur. Maral fiqurcuğunun baş hissəsi 1953-cü ildə 4 m dərinlikdə tapılmışdır. Şaxəli buynuzların yarısı sınmışdır. Gözləri iri yapma düyməciklərlə işarələnmişdir, bəbəyi nöqtəli çuxurla təsvir edilmişdir. Ağzı açıqdır, burnu dəliklərlə göstərilmişdir. Qulaqları xırda çıxıntılar şəklində göstərilmişdir. Boynu nisbətən yoğundur. 1952-ci ildə №2 yaşayış məskənində 2 m dərinlikdə heyvan fiqurcuğu tapılmışdır. Başı, dal pəncələri və bir qabaq pəncəsi qopmuşdur. Salamat qalmış hissənin istiqamətinə əsasən düşünmək olar ki, fiqurcuğun quyruğu yuxarı qaldırılmışdır. Salamat qalmış qabaq pəncəsi yan tərəfə yönəldilmişdir. Ehtimal ki, fiqurcuq dal ayaqları üstündə oturmuş iti təsvir etmişdir. 1947-ci ildə heyvan fiqurcuğu tapılmışdır. Onun bədəni kvadrat şəklindədir, ayaqları tamamilə qopmuşdur. Qulaqları dəyirmi kökələr şəklində göstərilmiş, burnu xeyli irəli çıxmışdır. Son əlamət ehtimal etməyə imkan verir ki, bu fiqur donuzu təsvir edir. Arxa hissəsində xırda dəlik vardır. İt fiqurcuğu 1949-cu ildə tapılmışdır. Nisbətən yaxşı qalmışdır. Şaquli qulaqları vardır, onlardan birinin ucu sınmışdır. Pəncələri və quyruğu uzundur. Ağzı açıqdır. Heyvan fiqurcuğu 1952-ci ildə Sudaqılan yaşayış məskənində tapılmışdır. Zahiri görkəminə görə Mingəçevirdə tapılmış bütün heyvan fiqurlarından fərqlənir. Dal ayaqları və quyruğu qopmuşdur. Quyruq kimi yuxarı qarılmış çıxıntı ilə başı göstərilmişdir. Mingəçevir də fiqurcuqlar arasında yeganə keçi fiqurcuğu, demək olar, bütövlükdə salamat qalmış, yalnız bir buynuzunun ucu sınmışdır. Ayaqları geniş aralanmışdır. Yuxarı qaldırılmış xırda çıxıntı ilə quyruğabənzər başı göstərilmişdir. Quyruğunun altında bir-birinin üzərində yerləşən iki dəlik vardır. Gözləri xırda çuxurlarla göstərilmişdir. Fiqur sarı rəngli gildən hazırlanmışdır. Üç ayağı, buynuzu və şaquli qaldırılmış quyruğunun ucu sınmışdır. Burnu dəliklə göstərilmişdir, qulaqları sallaqdır. Qaba şəkildə hazırlanmasına baxmayaraq, fiqurcuq orijinaldır. Heyvan, elə bil, hərəkətdə təsvir edilmişdir. Heyvan fiqurcuğu 1950-ci ildə tapılmışdır. Sxematik hazırlanmışdır. Tədqiq olunan bütün heyvan fiqurlarından fərqlənir. Ayaqları və quyruğu qopmuşdur. Hərçənd başı quş başı şəklində düzəldilmişdir. Bədəni heyvanı xatırladır. Boynuna təyinatı anlaşılmaz olan gil düyməciklər yapışdırılmışdır. Fiqurcuğun gözləri iri kökələrlə göstərilmişdir. O, üç fiqurcuq 1950-ci ildə tapılmışdır. Qabaq sol ayağı və buynuzu qopmuşdur. Orijinal düzəldilmiş başı diqqəti cəlb edir. Əvvəlki fiqurlardan fərqli olaraq, quyruğu aşağı sallanmışdır. 1948-ci ildə tapılmış heyvan fiquruğu zahiri görkəminə görə tısbağanı xatırladır. başı

və qabaq ayaqları sınmışdır. Açıq sarı rəngli gildən hazırlanmışdır. Heyvan fiquru. Zahiri görkəminə görə kərtənkələni xatırladır, dal hissəsi (quyruğu) qopmuşdur.

Heyvan fiqurcuğu 1952-ci ildə №2 yaşayış məskənində 1 metr dərinlikdə tapılmışdır. Zahiri görkəminə görə qeyri-adidir – qabaqda iki ayağı, arxada isə bir ayağı vardır. Quyruğunun altında üçbucaq formasında çuxur görünür. Sifətində iti burnu vardır. Zahiri görkəminə görə bunun qaban təsviri olduğunu təyin etmək mümkündür.

Mingəçevirin terrakota fiqurları arasında quşlar da vardır. Onlardan biri vaza formasında hazırlanmışdır. Orta hissə dəyirmidir, yapma düyməciklərlə bəzədilmişdir. Çox güman ki, usta xoruzu təsvir etmək istəmişdir. Quyruq şaquli çıxıntı ilə göstərilmişdir. Baş hissəsi orijinal düzəldilmişdir, dimdiyi və pipiyi olmuşdur ki, o da qopmuşdur.

Şamaxıda da çoxlu miqdarda heyvan fiqurcuğu tapılmışdır. Zahiri görkəminə, xüsusən ayrı-ayrı elementlərinə görə onlar Mingəçevir fiqurcuqlarından fərqlənir. Bunlar, əsasən, ev heyvanlarının təsvirləridir.

Heyvan fiqurcuğu 1968-ci ildə 1,3 metr dərinlikdə aşkar edilmişdir. Qıçları tamamilə və şaquli vəziyyətdə dayanan quyruğun bir tərəfi qopmuşdur. Ehtimal ki, ov iti təsvir edilmişdir. Sallaq qulaqları diqqəti cəlb edir, onlardan biri tamamilə qopmuşdur. Başqa bir heyvan fiqurcuğu 1958-ci ildə Xınıslıda tapılmışdır. Sağ qabaq və dal qıçları, habelə buynuzu qopmuşdur. Quyruğu çıxıntı ilə göstərilmişdir. Dal hissəsi qabaq hissəsi ilə müqayisədə daha qabarıq verilmişdir. Zahiri görkəminə görə qoçu xatırladır. Daha bir heyvan fiqurcuğu 1971-ci ildə tapılmışdır. Qıçları, quyruğu və burnu qopmuşdur. Qulaqlarının formasına görə ilin təsvirini müəyyən etmək mümkündür. Əvvəlki iki fiqurcuqdan fərqli olaraq, səthi hamardır, bişirilmiş ağ rəngli gildən hazırlanmışdır. Heyvan fiqurcuğu. Başı, qıçları və quyruğunun ucu qopmuşdur. Fiqurcuğun belində yəhər və ya palan düzəldilmişdir. Ehtimal ki, fiqurcuq atı təsvir edir. Heyvan fiqurcuğu. Dal hissəsi qopmuş, başı və qabaq qıçları salamat qalmışdır. Xarici görkəminə görə qoçu xatırladır. Qulaqları qopmuş, gözləri nöqtəşəkilli çuxurlarla göslərilmişdir. Maral fiqurcuğu Xınıslıda, №4 çala qəbrində tapılmışdır. Belinə qabırğanın divarcığı olan vaza yapışdırılmışdır. Bədənində bir tərəfdən bir, digər tərəfdən isə iki xırda üçbucaq çuxur yerləşmişdir.

İsmayıllı rayonunun ərazisində bir neçə heyvan fiqurcuğu aşkar edilmişdir, hazırlanma texnikasına görə onlar Mingəçevirdə və Şamaxıda tapılmış heyvan fiqurcuqlarına bənzəyir. Onlar, əsasən, ev heyvanlarını təsvir edir, ayrıca parçalarla təqdim edilmişdir.

Molla-İsaqlı kəndində heyvan fiqurcuğu tapılmışdır. Başı və qıçları qopmuşdur. Quyruğu xırda çıxıntı ilə göstərilmişdir. Zahiri görkəminə görə bunun keçi təsviri olduğunu müəyyən etmək mümkündür.

Molla-İsaqlı kəndində heyvan fiqurcuğunun parçaları tapılmışdır. Qabaq hissəsi və dal qıçlarının ucları sınmışdır. Quyruğu xırda çıxıntı ilə göstəril-

mişdir. Fiqurcuğun pis qalması onu müəyyən heyvanla eyniləşdirməyə imkan verir.

1969-cu ildə Molla-İsaqlı kəndində qoç fiquru tapılmışdır. Başının yuxarı hissəsi, çox güman ki, buynuzları ilə birlikdə qopmuşdur. Burnu bucaqvari çıxıntı ilə göstərilmişdir.

1969-cu ildə Mollaisaqlı kəndində at fiqurcuğu tapılmışdır. Quyruğunun ucu, qulaqları və burnu qopmuşdur. Qabaq və arxa tərəfdən şaquli çıxıntılarla bəzədilmiş yəhər və sinəbənd yapma üsulla təsvir edilmişdir. Yapma üsulla məharətlə düzəldilmiş qayış yəhərin üstündən keçir. Çənəsinin altında ağzından yüyən ağızlığını təsvir edən yapma zolaq keçir.

İsmayıllı rayonunun ərazisində Şıxdərəkəlləsi kəndinin yaxınlığında tapılmış at fiqurcuğu əvvəlki at fiqurcuğu ilə oxşardır, istisna təşkil edən budur ki, sinəbəndi yoxdur. Belində qayışlarla bərkidilmiş kəmər vardır. Boynunda yapma üsulla yalı göstərilmişdir.

Albaniya dövrü Azərbaycanının abidələrindən insan heykəlciyi əvvəlki dövrlərin tapıntılarına nisbətən miqdarca daha çoxsaylıdır. Fiqurcuqlarda eneolit və tunc dövrünün heykəlcikləri üçün səciyyəvi olan bəzi xüsusiyyətlər qorunub saxlanılmış və təkmilləşdirilmişdir. Hər şeydən əvvəl, bu, hazırlanma texnikasında (bütün heykəlciklər yapma üsulu ilə əllə düzəldilmiş və olduqca tez-tez bişirilmişdir), kiçik ölçülərdə ikonoqrafiyada (heykəlciklərin əksəriyyəti əlləri yan tərəfə uzadılmış halqa və ayaq üstə təsvir olunmuşdur) təzahür edir.

Cəlb olunmuş materialdan göründüyü kimi, Albaniya dövrünün heykəlcikləri öz xüsusiyyətlərinə görə eneolit və tunc dövrünün heykəlcikləri ilə müəyyən dərəcədə yaxın olduğunu büruzə verir. Ən əvvəl, həmin xüsusiyyət bu və ya digər məmulatın zahiri əlamətlərinə aiddir. Eyni zamanda Albaniya dövrünün heykəlcikləri böyük fərdiliyi ilə fərqlənir.

Albaniya dövrünün heykəlcikləri arasında həm qadın, həm də kişi təsvirləri vardır, bununla bərabər, qadınların heykəlcikləri əksəriyyət təşkil edir. Biz 46 qadın heykəlciyini tədqiq etmişik. Onların hər birində hansı hissə isə qopmuş, lakin bir sıra əlamətlər – döşlərin olması, ombaların forması, incə bel, yapma bəzək əşyalarının mövcudluğu – qadının təsvirini şəksiz müəyyən etməyə imkan verir. Həmin dövrün qadın heykəlciklərində bədənin yuxarı və aşağı hissələri arasında uyğunsuzluq aşkar edilir.

Səkkiz heykəlcik qadın fiqurunu bütövlükdə təsvir edir. Bədənin bütün hissələri realistcəsinə işlənilmişdir. Çox vaxt başın, əllərin və qıçların qopmasına baxmayaraq, təsvir olunan fiquru bütünlüklə təsəvvür etmək mümkündür.

On bir heykəlcik sxematik hazırlanmışdır. Onların arasında elə heykəlciklər vardır ki, bədəninin bir hissəsi konus şəklində və ya boyunun qarmaqvari şəkildə bitməsi ilə verilmişdir. Əllərin və çiyinlərin əvəzinə gil topası yapışdırılmışdır, yaxud onları yan tərəflərdə cızılmış xətlərlə təsvir edirlər.

İyirmi üç qadın heykəlciyinin boynunda, belində bəzək-məişət əşyaları vardır. Döşlərin arasında onların izləri qalmışdır. Onları heykəlciklər düzəldildikdən sonra yapma üsulu ilə hazırlayırdılar. Bəzək-məişət əşyaları muncuqlardan, medalyonabənzər yapma bərbəzək şeyləri və kəmər ilə təmsil olunmuşdur. Albaniya dövrünün heykəlcikləri bəzi əlamətlərinə görə əvvəlki dövrün heykəlciklərindən fərqlənir. Eneolit və tunc dövrü heykəlciyinin boynunda bir sap həmail təsvir olunduğu halda, indi sapların miqdarı 8–10 ədəddir. Bəzək-məişət əşyalarının özü daha diqqətlə seçilmişdir. Bu cəhətdən daha çox realistcəsinə təsvir olunan kəmərlər diqqəti xüsusilə cəlb edir. Daha maraqlı bir detalı qeyd etmək lazımdır: bəzi heykəlciklərin qaba şəkildə hazırlanmasına baxmayaraq, onların bəzək əşyaları zərif və daha gözəgəlimli verilmişdir. Qədim heykəlciklərin bəzək-məişət əşyaları yalnız yapma üsulu ilə verilirdi. Albaniya dövrünün heykəlciklərində, bu üsulla yanaşı, bəzək-məişət şeylərinin nöqtəvari və oymalı xətlərlə verilməsi kimi yeni üsul meydana gəlmişdir.

Bəzi heykəlciklərin bəzək-məişət əşyaları tamamilə yoxdur. Onlar çox qaba və sadə şəkildə düzəldilmişdir. Adətən onlar bədənin yuxarı və aşağı hissələri arasında uyğunluğun pozulması ilə fərqlənir. Onlar üçün də incə bel, qalın dodaqlar və qabarıq ombalar səciyyəvidir.

Qadın heykəlciklərinin bir qrupunda cinsiyyət orqanı nöqtələrlə, yaxud oyma xətlərlə verilmişdir. Bu heykəlciklər zahiri görkəminə görə fərqlənir. Heykəlciklərin hamısında bu cür incə bel, qabarıq ombalar vardır.

Bu dövrün qadın heykəlciklərinin əksəriyyəti ayaq üstə duran fiqurcuq şəklində, bəzən büst şəklində hazırlanmışdır. Fiqurların əksəriyyətinin qıçları çiyinlər enində aralanmış, əlləri kənara uzadılmışdır. Çox vaxt baş üslublaşdırılmış qarmağabənzər çıxıntı ilə verilmişdir. Elə nüsxələr vardır ki, onların başı əvəzinə sadəcə uzun boynu təsvir edilmişdir.

Büst formasında hazırlanmış heykəlciklər Albaniya dövrünün abidələrində azlıq təşkil edir. Onlarda ayaqlar əvəzinə yastı altlıq düzəldilmişdir. Bu heykəlciklər ayaq üstə təsvir olunmuş fiqurlardan əsaslı surətdə fərqlənir. Doğrudur, onlarda əksər hallarda baş üslublaşdırılmış, yaxud qarmağabənzər çıxıntı ilə verilmişdir. Lakin əsas fərqləndirici xüsusiyyət bu heykəlciklərdə əllərin yoxluğundan ibarətdir, ya da əllər sinədə, bəzən aşağı sallanmış, bədənlə birləşmiş halda təsvir edilmişdir.

Albaniya dövrü Azərbaycanının heykəlcikləri arasında kişi heykəlcikləri də vardır ki, onlar qadın heykəlcikləri ilə müqayisədə azsaylıdır. Biz bu cür 10 heykəlciyi nəzərdən keçirmişik. Zahiri və ikonoqrafik əlamətlərinə görə onlar qadın heykəlciklərindən fərqlənir. Ayrı-ayrı parçalar halında təqdim olunmuş kişi heykəlcikləri arasında qədim albanların üz cizgilərini görməyə imkan verən iki baş fiqurcuğu vardır. Kişi heykəlcikləri ayaq üstə durmuş vəziyyətdə təsvir edilmişdir. Tunc dövrünün heykəlciklərində olduğu kimi, onların belinə qurşaq sarılmışdır. İki kişi heykəlciyi xüsusi maraq doğurur: onlardan biri-

nin sağ ayağı spiralşəkilli yapma zolaqla-sarğı ilə bəzədilmişdir. İkinci fiqurun çiyinlərinə kəsəklər yapışdırılmışdır. Bu heykəlcik nümunələri Albaniya dövrünün və əvvəlki dövrlərin heykəlciklərinin fərqlərini müəyyən etmək üçün böyük maraq doğurur. Kişi heykəlciklərinin digər xüsusiyyəti budur ki, onların ayaqları həmişə aralanmış vəziyyətdə təsvir edilmiş, bədəni ilə qurşaqdan aşağı proporsional düzəldilmişdir.

Bu dövrdə heykəlciklər əl ilə yapılır, sonra isə bişirilirdi. Bişirilməmiş nüsxələrə də rast gəlinir. Bişirilmiş heykəlciklər keyfiyyətinə görə əvvəlki dövrün heykəlciklərindən fərqlənirdi ki, bu da bişirici dulusçuluq sobalarının meydana gəlməsi ilə bağlıdır. Görünür, bu sobalarda, qab-qacaqla yanaşı, insan heykəlcikləri, bəzən heyvan heykəlcikləri də bişirilirdi. Bunu Mingəçevirdə bişirici dulusçuluq sobalarında heykəlciklərin tapılması sübut edir. Bişirilmə ilə əlaqədar olaraq heykəlciklərin rəngi dəyişilir, temperaturdan asılı olaraq qırmızı, açıq-qara, boz və başqa çalarlar alırdı.

Qeyd etmək lazımdır ki, heykəlciklərin keyfiyyəti müəyyən dərəcədə gilin tərkibindən asılı idi. Albaniya dövrünün heykəlciklərinin əksəriyyəti möhkəmlik üçün azacıq narın qumla qarışdırılan yaxşı təmizlənmiş gildən hazırlanırdı.

İslamaqədərki dövr Azərbaycanının xırda gil plastikasının bədii-texniki təhlilinə yekun vuraraq, etiraf etmək lazımdır ki, ayini mərasimlərin bir hissəsi olduğuna baxmayaraq, bu plastika öz zəmanəsinin estetik prinsiplərini və bədii qanunlarını özündə ehtiva edirdi.

Antropomorf və zoomorf gil heykəltəraşlığı, tunc və daş dövrləri ilə yanaşı, Azərbaycan heykəltəraşlığının ilk çağlarında mühüm yer tuturdu.

# III FƏSİL

## AYİNİ PREDMETLƏRDƏ, BƏZƏK-MƏİŞƏT ƏŞYALARINDA VƏ EV MÜXƏLLƏFATINDA DEKORATİV VƏ SİMVOLİK HEYKƏLTƏRAŞLIQ

Heykəltəraşlıq, Azərbaycanın İslamaqədərki dövründə plastik incəsənətin bir növü kimi əslində, heç də təkcə təsviri sənətin növ hüdudlarında geniş yayılmaqla qalmayıb, həm də çox vaxt ev, yaxud da ayin müxəlləfatının müxtəlif predmetlərində tətbiqi və ya simvolik element qismində çıxış edirdi. O, tətbiqi və ya simvolik funksiyaya malik olub-olmadığından asılı olmayaraq, plastik təfəkkürün və heykəltəraşlığın topladığı ənənələri əks etdirirdi. Buna əsaslanaraq, keramikada, metalda, bəzək-məişət əşyalarında dekorativ və simvolik heykəltəraşlıq islamaqədərki



*59. Keramik zoomorf qab. Mingəçevir, e.ə. II minillik.*

dövrün heykəltəraşlıq ənənələrinin inkişafı və formalaşması haqqında təsəvvürlərimizi zənginləşdirir.

Bu dövrün totemik və anemistik təsəvvürləri elə bir qidalandırıcı mühit olmuşdur ki, məhz o, gündəlik məişətdə işlədilən predmetlərlə zoomorf və antropomorf heykəltəraşlıq nümunələrinin sintezini qabaqcadan müəyyən etmişdir. Tədqiqatçı Y.M.Maksimovanın qeyd etdiyi kimi, "animistik təsəvvürlər fiqur keramikasının inkişafına xüsusi qüvvə ilə təsir göstərirdi..." (47.3).

Buradaca qeyd etmək lazımdır ki, keramikada və metalda heykəltəraşlıq dekorunun olması, habelə predmetlərin özlərinə heykəltəraşlıq formalarının verilməsi çox vaxt ayin keramikasında və qəbir inventarında aşkar edilmiş predmetlərdə müşahidə olunur. Bu predmetlərin böyük əksəriyyəti, əlbəttə, onların yaradıcılarının dini-ideoloji təsəvvürlərini əks etdirir.

Üzərində heykəltəraşlıq yapmalarının dekor elementləri kimi təzahür etdiyi predmetlər nisbətən azdır. Bu halda, bir qayda olaraq, heykəltəraşlıq obrazları üslublaşdırılaraq, ornamental dekora çevrilir ki, bu da heç də təkcə estetik zövqləri deyil, həm də mücərrəd-simvolik formalarda ideoloji dəyərləri, nəhayət, plastika ənənələrini və yaxud regionun qanunlarını əks etdirir. Keramika qabları predmetlərin ən çoxsaylı qrupudur ki, bu predmetlərdə heykəltəraşlıq onların ayrılmaz hissəsidir. Keramika qablarında heykəltəraşlıq istər qabın özünün formalarında, istərsə də qabların ucunda, onların boğazında, yaxud dəstəklərində mövcud olan yapmalar şəklində özünü göstərir.

Heykəltəraşlıq elementlərinə malik ən erkən keramika nümunələri tunc dövrünə aid edilir. Bu dövrün keramikasında və metalında zoomorf heykəltəraşlığının əks olunması məlum ərazidə totemik inancların yayılması ilə bağlıdır.

*60. Keramik zoomorf qab. Ziviye (Zeyvə), e.ə. IX-VIII əsrlər.*



Bu dövrün tətbiqi heykəltəraşlığı haqqında qəbirlərdə aşkar edilmiş ayini qabların nümunələrinə əsasən təsəvvür yaratmaq olar. Mingəçevirdə tapılmış, tufdan yonulmuş və gümüş mismarlar-mıxçalarla bəzədilmiş kasa bu cür nümunələrdən biridir. Kasadan kənara çıxan, buynuzları birləşmiş qoçların iki oyma başçığı bütün kompozisiyanın məna və bədii dominantıdır. Qoçların qoşa başcıqları formaların xırda detallaşdırılmasına yol verilmədən üslublaşdırılmış şəkildə hazırlanmışdır. Qoçla-

rın birləşdirilmiş buynuzları, onların obsolyut simmetriyası müəlliflərin və bu kasadan istifadə edənlərin dünyagörüşünün dualist xarakterini göstərir. Qoçların başcıqlarının bu cür qoşa, yaxud simmetrik yerləşdirilməsinə bu dövrün qab-qacağının ornamental dekorlarında da rast gəlinir.

Azərbaycan keramikasında zoomorf və antropomorf heykəltəraşlığın sintezi tunc dövrünün sonunda və dəmir dövrünün başlanğıcında müşahidə olunur. Ayini qab-qacağın bu cür nümunəsi Cənubi Azərbaycanda (Həsənlu) Daysonun başçılıq etdiyi Amerika Arxeologiya İnstitutunun ekspedisiyası tərəfindən aşkar edilmişdir (79.16–27). Üçayaqlı qabda – tripodda dua edən vəziyyətdə (adorant) əllərini yuxarı qaldırmış insanın heykəltəraşlıq təsviri vardır. Fiqurcuq kişini konkret portret cizgiləri olmadan təsvir edir. Tripodun boğazında dağ keçilərinin üç heykəltəraşlıq başcığı vardır, başcıqların sifətləri qabın içərisindən qabarıq şəkildə bayıra çıxmışdır. Burada heykəltəraşlıq forması ilə qabın formasının sintezi mükəmməllik dərəcəsinə çatdırılmışdır. Heyvanların başcıqlarının istiqaməti qabın irəli çıxmış ayaqlarının istiqamətinə uyğun gəlir. Heyvanların buynuzları qabın boğazının çənbəri ilə birləşərək, bütün qabın plastikasını zənginləşdirmiş vahid plastik forma əmələ gətirir.

Tunc dövrünün metal ayini və məişət predmetlərində heykəltəraşlıq da mühüm yer tuturdu. Bu cür predmetlərdə totem heyvanlarının xırda fiqurları, ayin məqsədilə yanaşı, dekorativ funksiyaları da yerinə yetirirdi. Metal üzərində heykəltəraşlıq plastika forması, ifrat dekorativliyi və şərtiliyi ilə fərqlənirdi. Burada, bir qayda olaraq, heyvanın xarakterini nəzərə çarpdırmaq deyil, onu simvol, yaxud obereq kimi təqdim etmək vacib idi. Məsələyə belə yanaşdıqda heykəltəraşlıq obrazı simvol səviyyəsinədək ümumiləşdirilirdi ki, bu da yalnız heyvanın növünün tanınmasını nəzərdə tuturdu. Məhz bu səbəbdən çox vaxt bütöv bir təsvir yalnız onun bir hissəsi ilə əvəz edilirdi. Totemin simvolik mövcudluğu vacib deyildi, bu funksiyanı isə həmin heyvanın bir hissəsi də yerinə yetirə bilərdi.

*61. Fiqurlu qab. Həsənlu, e.ə. IX-VIII əsrlər.*



Məişət cihazlarında xırda heykəlin tipik obrazı bürünc güzgünün dəstəyi üzərində keçi təsviridir (məhsuldarlıq simvoludur). Güzgü Mingəçevirin yaxınlığında tapılmış daş yeşik tipli məzarlığın qəbir inventarından nəşət edir. Keçinin buynuzları sınmışdır. Fiqurcuq olduqca

sxematik hazırlanmışdır. Güzgünün dəstəyi haçalanaraq, heyvanın ayaqlarına keçir və onun zərif bədənini nəzərə çarpdırır. Fiqurcuğun güzgünün dəstəyi ilə bu cür birləşdirilməsi heyvan fiqurunu və güzgünün funksional hissəsinə – qulaqcığına çevirmişdir, güzgü bu qulaqcıqla kəmərdən asılırmış. Güzgünün özü kimi, heyvan fiqurcuğu da formaca tökmə üsulu ilə hazırlanmışdır. Bu dövrdə tökmə texnikasının zəif inkişafı (orta tunc dövrü) predmetlərdə heykəltəraşlıq elementlərinin diqqətlə plastik işlənilməsinə imkan vermirdi ki, heyvan fiqurcuğunun sxematikliyi də bununla izah olunur.

Dəmirlə işləməyin mənimsənilməsi ilə (e.ə. II minillik) metaləritmə sənəti təkmilləşir, tökmə texnikası daha yüksək zirvələrə çatır. İndi artıq bürüncdən yalnız dekorativ bəzək əşyalarında istifadə olunur, həmin əşyalarda heykəltəraşlıq elementləri məcburi atributa çevrilir. Çoxlu miqdarda sancaq naverşi və həmail xırda zoomorf heykəltəraşlıq nümunələri ilə tamamlanır. Mingəçevir və Xaçbulaq məzarlıqlarında tapılmış bürünc sancaqlar bu cür xırda plastikanın nümunəsidir. Mingəçevir sancağı dağ keçisinin üslublaşdırılmış buynuzları ilə bəzədilmişdir, xaçbulaq sancağında heyvan bütünlüklə təsvir edilmişdir. Maraqlı burasıdır ki, heyvanın silueti, demək olar, Qobustan qayalarında təsvir olunmuş dağ keçilərinin siluetlərini dəqiqliklə təkrar edir.

Qarabağın kurqan məzarlığında aşkar edilmiş öküz başcığı şəklində əsa başlığı tunc dövrü heykəltəraşlığının maraqlı nümunəsidir. Qəlibləmə və hazır forma üzrə tökmə üsulu ilə hazırlanmış heyvan başcığı dekorativ-simvolik xarakter daşıyır.



*62. Fiqurlu qab. Mingəçevir, e.ə. V-III əsrlər.*

Metalla müqayisədə heykəltəraşlıq keramik qablarda daha geniş yayılmışdır. Totemizm şəraitində heyvanların və quşların heykəltəraşlıq obrazları, demək olar, hər bir ayini qabda vardır. Qazıntılarda aşkar edilmiş zoomorf qabların böyük bir qrupu heyvana və qəbir keramika inventarında onun maddi təcəssümünə əhəmiyyət verdiyinə dəlalət edir. Tədqiqatçıların əksəriyyətinin fikrincə, bu qablar ayini-mərasimi təyinata malik idi və qurbanvermə ilə bağlı olan ayinlərin icrası zamanı axirət dünyasında dəfn olunmuş insana xidmət etməli idi.

Çoxsaylı zoomorf keramikasının təhlili belə bir nəticə çıxarmağa imkan verir ki, onların əksəriyyəti çaydanabənzər formaya malikdir, bu və ya digər heyvanın fiqurcuğu ilə bağlıdır. Beləliklə, qabdan maye, sanki, heyvan və ya quş fiqurcuğunun özü tərəfindən tökülürdü.

Bu qabların təyinatı haqqında danışarkən tədqiqatçıların əksəriyyəti belə bir fikirlə razılaşır ki, onlar qurbanvermə və ya məhsuldarlığın artırılması mərasimləri zamanı istifadə olunan qablardır. Bu ayinlərin icrası zamanı qurbanlıq maye (xoma) birbaşa məhsuldarlıq bəxş edən totem-himayədar olan heyvan və ya quşun ağzından tökülürmüş. Qurbanlıq mayenin həyat bəxş edən qüvvəsi müqəddəs heyvan fiqurcuğu ilə uyuşurdu.

*63. Zoomorf qab.*
*Mingəçevir, e.ə. IV-III əsrlər.*



Bu cür keramikanın çoxsaylı nümunələri Mingəçevirdə, Zividə, Həsənluda, Təpə-Sialkda və digər yerlərdə aşkar edilmişdir.

Dolçayabənzər və çölməyəbənzər qablar da çoxsaylı qrup təşkil edir; həmin qablarda heyvanların fiqurcuqları, ya qabın dəstəyində, ya da boğazında vardır. Güman edilir ki, bu qablarda qurbanlıq yemək saxlanırmış. Bu cür qablar, bir qayda olaraq, dəfn olunmuş adamın baş tərəfində aşkar edilir. Heyvanların heykəlləri orada cüt yerləşdirilirdi (bir qayda olaraq, simmetrik surətdə).

Zoomorf heykəllərlə yanaşı, antropomorf heykəllər və keramika nümunələri məlumdur. İki bu cür qabın qırıqları qazıntılar zamanı aşkar edilmişdir. İnsan başının formasına malik qabın dəstəsi Qaratəpə qəsəbəsinin aşağı mədəni təbəqəsində qazıntılar zamanı tapılmışdır. Keramika məmulatı, əsasən, Qaratəpədən nəşət edir. Onlar üçbucaqlarla və digər həndəsi fiqurcuqlarla bəzədilmişdir. Bu fiqurcuqlar

kəsmə xətlərlə örtülmüşdür. Gil qabların nümunələri formalarına və hazırlanma texnikasına görə Xocalı–Gədəbəy mədəniyyətinin keramika məmulatını xatırladır.

Qabların dəstəkləri küllə və kömürlə doldurulmuş ocaqda, 0,8 m dərinlikdə tapılmışdır. Dəstəyin üstünə insan başının təsviri yapışdırılmış, bir qədər çökəkli sifətində donqar burun göstərilmiş, alnı azacıq mailidir. Qaşları nazik xətlə, gözləri isə ellipsvari çökəklərlə göstərilmişdir. Ağzı azacıq açıqdır. Qulaqları başına nisbətən iridir. Qaşlardan aşağı üz onun kəlləsini ayıran cızma xətlə əhatə olunmuşdur. Baş geyimi araqçın şəklində göstərilmişdir. Qabın dəstəyinə yapışdırılmış başı çənbərin başı üzərində bir qədər ucalır. Aşağı hissədə başcıq cızılmış sünbülvari təsvirlə bəzədilmişdir. O.Ş.İsmizadənin fikrincə, üzünün cizgilərinə görə, başcıq müəyyən dərəcədə Ön Asiyanın antropoloji tipini xatırladır (assiroid). Mil düzündə toplanmış digər arxeoloji materiallarla birlikdə o, başcığın eramızdan 1-ci minilliyin ortalarına aid olduğunu deyir. Səth üzərində insan fiqurunun təsviri olan 2-ci qab Naxçıvan Diyarşünaslıq Muzeyində saxlanılır. O, Nuhdaban (Nuhun qəbri) adlı yerdə, Qəhniqala şəhərciyinin yaxınlığında tapılmışdır. Fiqurcuq dəstəyin səthinə deyil, dəstək əvəzinə qabın qapağına yapışdırılmışdır. Maraqlı burasıdır ki, qapaq qırmızı gildən hazırlanmış və bundan savayı, qırmızı rənglə boyanmışdır. Fiqurcuğun arıq sifətində nisbətən irəli çıxmış burnu, gözləri təsvir olunmuş və ağzı çökəklərlə verilmişdir. Əvvəlki təsvirdən fərqli olaraq, başı bütünlüklə örtən



*64. Daş fiqurlu kassa. Mingəçevir, e.ə. II minillik.*

və qulaqları qapayan baş geyimi vardır, onun qabaq hissəsi 1 sm irəli çıxır. Boynuna yapma geniş gil həmail dolanmışdır. O.Ş.İsmizadə kəllənin formasına və üzün quruluşuna görə fiquru da Kiçik Asiyanın antropoloji tipinə aid edilir. Şlemi xatırladan baş geyimin formasına görə ehtimal etmək olar ki, fiqur döyüşçünü təsvir edir. Onun hündürlüyü 17 sm, eni 7,5 sm-dir. Fiqurcuğun enini qabın çələngin diametri ilə müqayisə edilməsi göstərir ki, qab kiçik olmuşdur. Bu cür qab üçün 17 sm hündürlüyündə qapaq lazım deyildir. Daha çox bu qab gündəlik məişətdə işlədilmirdi, əksinə, ayini məna daşıyırdı.

Başqa bir qab (vaza) bu cür keramikanın çox maraqlı nümunəsidir, onun üzərində zoomorf heykəl də, antropomorf heykəl də vardır. Eramızdan əvvəl IX-VIII əsrlərə aid olan və Həsənluda aşkar edilən boz rəngli keramik qab, bir tərəfdən su quşunun başcığı ilə, digər tərəfdən isə əlində quş şəklində qurbanlıq qab tutan insanın fiqurcuğu ilə bitir.

Öküz başcığı şəklində hazırlanmış fiqurcuqlar Qaratəpə qəsəbəsində də aşkar edilmişdir. Digər ev heyvanlarını, xüsusən qoçu təsvir edən fiqurlara da rast gəlinir. Qoç fiqurlarından biri Ağcabədi rayonunun ərazisindəki abidədən nəşət edir. Başcıq qabın boruvari burnu üzərinə yapışdırılmışdır, geriyə əyilmiş buynuzlar vardır. Alnında yanaşı yerləşmiş üç yapma ornament vardır. Müəllif Qaratəpədə tapılmış anoloji fiqurlar əsasında onu e.ə. V-IV əsrlərə aid edir.

Eneolit və tunc dövrü üçün heyvanların bütöv fiqurcuqları səciyyəvi olduğu halda erkən dəmir dövründən etibarən onları bədənin ayrı-ayrı hissələri, keramik qaba yapışdırılmış başın bir hissəsi ilə əvəz etdilər. Yalnız tək-tük hallarda qabların səthində heyvanların bütöv fiqurcuqlarına rast gəlinir.

1957-ci ildə Qaratəpə yaşayış məskənində qazıntılar zamanı mədəni təbəqənin ikinci horizontunda zoomorf qabların xeyli miqdarda qəlpəsi toplanmışdır. İki qəlpə xüsusilə maraqlıdır, onların səthində qoçun başı təsvir edilmişdir. Hər bir fiqurcuq səthi ornamentlərlə bəzədilmiş qabın boruvari burnu üzərində yerləşdirilmişdir. Qoçun buynuzları daxilə burulmuş, qarmaqvari şəkildə verilmişdir. Fiqurcuğun gözləri, bütöv heykəlciklərdən fərqli ola-

*65. Fiqurlu keramik qab. Mingəçevir, e.ə. IV-III əsrlər.*



raq, gil düyməciklərlə işarələnmişdir. Qoçların sifətləri qabın buruncuğuna tərəf istiqamətlənmişdir. Bütövlükdə Qaratəpədə 1957-ci ildə qazıntılar zamanı 12 zoomorf qabın qəlpələri aşkar edilmişdir. Onlardan 10-nun səthində qoç başı, 2-də öküz başı təsvir edilmişdir. Əldə edilmiş materiallar əsasında zoomorf qabların aşkar olunduğu təbəqə eramızdan əvvəl V-IV əsrlərə aid edilir.

1980-ci ildə Qaratəpədə daha bir neçə zoomorf fiqurcuq aşkar edilmişdir. Onlardan biri qara rəngli gildən hazırlanmış maralın başıdır. Onun yalnız baş hissəsi təqdim edildiyinə görə bunun müstəqil fiqurcuq olduğu, yaxud qabın möhkəmləndirilməsinə xidmət etdiyini müəyyənləşdirmək çətindir. Qeyd edək ki, qabın dəstəyinə, yaxud burnuna bərkidilmiş fiqurcuqlar adətən içiboş olduğu halda maralın başı natamam olurdu. Çox güman ki, o, maralın bütöv fiqurunun bir hissəsidir. Burun pərəkləri çökəklərlə təsvir edilmişdi, ağzı açıq idi. Gözləri yapma düyməvari çıxıntılarla verilmişdir. Buynuzlardan yalnız izlər qalmışdır. Bişirmənin keyfiyyəti aşağı olduğuna görə, fiqurcuqlar ovulur. Başının ölçüləri böyük deyildir: qabaqdan uzunluğu 5 sm, boynunun uzunluğu 3 sm-dir.

1980-ci ildə Qaratəpədə qazıntılar zamanı səthində 1957-ci ildə tapılmış fiqurcuqların analoqu kimi, öküz və qoç fiqurcuqları olan qab aşkar edilmişdir. Heyvan fiqurcuqlarına təkcə gil qabların səthində deyil, habelə tikinti qalıqları arasında rast gəlinir. Bu nöqteyi nəzərdən binanın 1956–1957-ci illərdə aşkar edilmiş qalıqları xüsusi maraq doğururdu. Sarıtəpədə qazıntılar zamanı Qazax rayonunda aşkar edilmiş qalıqları xususi maraq doğurur. 70 sm qalınlığında kül qatı ilə örtülmüş qalıqlar aşkar edilmişdir. 9X4,6 m sahəsi olan bu bina, ola bilsin, ayini əhəmiyyətə malik idi. Onun interyeri xüsusilə maraqlıdır: şərq qapısı alçaq, qərb qapısı nisbətən hündürdür. Binanın ortasında üç sütun var idi, qərb qapısı kimi, ornamentlə örtülmüşdü. İçəridə bir tərəfdən donuz fiqurcuğu, digər tərəfdən qoç başı aşağı burulmuş buynuzları ilə təsvir edilmişdir. Güman etmək olar ki, divar bir tərəfdən bu fiqurcuqla başa çatmışdır. Qoç başının aşağı hissəsi alt tərəfdən içiboşdur, göründüyü kimi, o, yerə basdırılmış dirəyə geydirilirdi. Buradaca qoçun başını təsvir edən başqa bir fiqurcuq tapılmışdır. Onun burun pərəkləri çökək xətlə işarələnmiş, alt çənəsi bir qədər qabarıqdır. Görünür, o da dirəyin yuxarı ucuna geydirilirdi ki, bunu da fiqurcuğun içi boş hissəsində kömürə dönmüş ağacın

*66. Zoomorf keramik qab. Ziviye (Zeyvə), e.ə. VIII-VII əsrlər.*



qalıqları təsdiq edir. Həmin binanın qalıqları təmizləndiyi zaman divarlardan qopmuş və ətrafa səpələnmiş yapma bəzək-məişət əşyaları ilə bəzədilmiş ilan başı aşkar edilmişdir. Şərq divarının yaxınlığında birləşmiş qab tapılmışdır ki, onun dəstəyində ilanın və düymənin yapma fiqurcuqları vardır. Düyməciklər çiyinlikdə qabdan aşağı hissəyə yapışdırılmışdır. Bu cür qab, təbii ki, məişət məqsədlərinə xidmət edə bilməzdi. Çox güman ki, ondan dini ayinlərin icrası zamanı istifadə edirdilər.

Sarıtəpədə tapılmış təsadüfi materiallar arasında boz rəngli gil qabın heyvan fiquru şəklində dəstəyi vardır. Zahiri görkəminə görə güman etmək olar ki, bu, qoç təsviridir. Qulaqları və buynuzları tamamilə qopmuşdur. Onların yalnız izləri qalmışdır. Həmin materiallar arasında tökmə üsulu ilə hazırlanmış bürünc at fiqurcuğu tapılmışdır. Atın belində ipin uzadılması üçün dəlik açılmışdır.

Sarıtəpə binasının interyeri, yapma ilan fiquru ilə birləşmiş cüt qabın, gil qabın qoç, ilan başcığı şəklində dəstəyinin tapılması, bürünc at fiqurcuğu, qoç və donuzu təsvir edən fiqurcuqlar – bütün bunlar ona dəlalət edir ki, xarabalıqlar məbədə məxsusdur. Tədqiqatçılar bu qalıqları e.ə. 1-ci minilliyin ilk əsrlərinə aid edirlər.

Azərbaycan ərazisində zoomorf qablar Mingəçevirdə də tapılmışdır. Onların əksəriyyəti daha sonrakı dövrə – təqribən e.ə. 2-ci əsrə – eramızın 1–2-ci əsrlərinə aiddir. Lakin Mingəçevirdə aşkar edilmiş zoomorf qablar arasında arxaik formalı qablara rast gəlinir; tədqiqatçılar onları e.ə. VII-V əsrlərə aid



*67. Zoomorf keramik qab.*
*Ziviye (Zeyvə), e.ə. VII əsr.*

edirlər. Onlardan biri 1946-cı ildə Q.İ.İone tərəfindən içərisində skelet olan qrunt qəbirdə tapılmışdır. Bu fiqurlu qabın burnu üzərində, təqribən onun haşiyəsi səviyyəsində it fiqurcuğu yerləşdirilmiş və onun başı qopmuşdur. Qabın iki dəstəyi-tutacağı vardır: birincisi haşiyənin kənarındadır, qabı şaquli vəziyyətdə qaldırmaq üçün nəzərdə tutulmuşdur, ikincisi qabın böyrünə yapışdırılmışdır və heyvan fiqurunu xatırladır.

Heyvan və insan fiqurcuqları heç də təkcə Azərbaycan ərazisi üçün səciyyəvi deyildir, onlara Gürcüstan və Ermənistan ərazisində də rast gəlinir. Məsələn, alnında üçbucaq təsviri olan öküzün kiçik başı Gürcüstan ərazisində tapılmışdır; o, Gədəbəydə aşkar edilmiş öküz başına bənzəyir, lakin alnında üçbucaq təsviri olmayan bu cür başcıqlara Ermənistan ərazisində rast gəlinir. Azərbaycan, Gürcüstan və Ermənistan ərazilərində tapılmış başcıqlar arasında oxşarlıq, ən əvvəl, onların kiçik ölçüsündə və sifətin bəzi detallarının təsvirində təzahür edir.

Ümumən, zoomorf və antropomorf qabların yayılması sahəsi genişdir. Bu tipli qabların müxtəlif yerlərdən nəşət etməsinə baxmayaraq, hazırlanma texnikasına görə (əsasən, əl ilə hazırlandığı hallarda) və qabın səthində yerləşməsinə görə (insan və heyvan fiqurcuqlarının ayır-ayrı elementləri çox vaxt qabın dəstəklərinin, qapaqlarının və burunlarının səthində yerləşdirilmişdir), onların arasında müəyyən oxşarlıq vardır. İran ərazisində Mərlik yaşayış məskənində tapılmış zoomorf qablarla Mingəçevirdə aşkar edilmiş, bir qədər arxaik forması ilə fərqlənən qablar arasında bu cür yaxınlıq qeyd olunur. Beləliklə, erkən dəmir dövrünə aid olan Azərbaycan abidələrinin tədqiqi zamanı az miqdarda insan və heyvan heykəlcikləri tapılmışdır, həm də onların hamısı qəlpələr halındadır. Tapıntıların belə azsaylı olmasını, bir tərəfdən, müvafiq arxeoloji tədqiqatların həcmi, digər tərəfdən, o dövrün cəmiyyətinin özündə baş verən dəyişikliklərlə izah etmək mümkündür.

*68. Zoomorf keramik qab. Ziviye (Zeyvə), e.ə. VII əsr.*



Mingəçevirin küp-qəbirlərində tapılmış gil qabların bir neçə nümunəsi öz formalarına görə Yaloylutəpə üçün səciyyəvi olan qabların analoqudur. Göründüyü kimi, Yaloylutəpə materialları ilə küp-qəbirlər mədəniyyəti arasında əlaqə vardır. Digər tərəfdən, bu mədəniyyətlər eyni dövrə aiddir və vahid bir ərazini əhatə edir. Hər iki mədəniyyətin arxeoloji materiallarına eyni məzarlıqda çox tez-tez rast gəlinir.

Bu arxeoloji mədəniyyətlərin öz aralarında tamamilə oxşar olduğunu nəzərə alaraq, C.A.Xəlilov iki arxeoloji mədəniyyətin

bir ərazidə və bir tarixi dövrdə müəyyənləşdirilməsini nə metodik, nə də nəzəri cəhətdən doğru hesab etmir və onların elmi əsası olmadığını söyləyir.

Həqiqətən, Albaniyada qədim yerli tarixi köklərə və lokal variantlara malik vahid mədəniyyət olmuşdur. Onun mahiyyətini nəzərə alaraq, teriminoloji baxımdan alban mədəniyyəti adlandırmaq düzgün olardı.

Albaniya dövrünə aid olan Azərbaycan abidələrinin qazıntıları nəticəsində insan bədəninin ayrı-ayrı təsvirləri ilə bəzədilmiş səthə malik gil qablar da aşkar edilmişdir. Son illərdə Mingəçevirdə, Şamaxıda və bir sıra başqa rayonlarda qazıntılar zamanı antropomorf elementləri olan gil qabların nümunələri tapılmışdır.

1960-cı ildə Xınıslı yaxınlığında (Şamaxı rayonu) qırmızı gil antropomorf qab tapılmışdır ki, onun boğazında qadın təsviri vardır. Qadının iri, dəyirmi gözləri, azacıq donqar burnu vardır, hörükləri çiyinləri üstünə salınmışdır, sinəsində yapma üsulu ilə verilmiş bəzək əşyaları vardır. Qab böyük ustalıqla hazırlanmışdır.

Qabın konstruktiv forması və qabarıq qadın fiqūru bir-birini tamamlayır. Qabın e.ə. III əsrə – eramızın I əsrinə aid olduğu qeyd edilir.

1965-ci ildə elə həmin ərazidə daş qutu tipli qəbirdə gil qarışığından hazırlanmış qırmızı rəngli antropomorf qab aşkar edilmişdir. Qabaq tərəfdən səthi qurşağa qədər yapma naxışla bəzədilmişdir, arxa tərəfində ornament yoxdur. Yastı oturacağı olan yarımdəyirmi dəstək fiqurun başını qabın korpusu ilə birləşdirir. Başında yapma zolaq və dəyirmi gil düyməciklər təsvir edilmişdir. Burnu nisbətən uzundur, qarmaqvaridir, bu, qədim dövrün abidələrindən olan bəzi qadın heykəlcikləri üçün səciyyəvidir. Qulağının yerində sırğanı və düyməciyi xatırladan yapma gil zolaq təsvir edilmişdir. Gözləri də yapma dəyirmi düyməciklər şəklində verilmidir. Sinə hissəsinə iki çıxıntı yapışdırılmış, boynunda xırda dəyirmi düyməcikləri olan həmail vardır. Qab dolçayabənzər olub, içi boşdur.

*69. Fiqurlu keramik qab. Həsənlu, e.ə. II minillik.*



Xınıslı yaşayış məskənində daş qutu tipli qəbir IV əsrin sonu – VII əsrin sonuna aiddir. Digər tərəfdən, xatırladılan



*70. Tunc heykəl.*
*Qarabağ, e.ə. IX əsr.*

daş qutudan nəşət edən gil məmulatı Mingəçevirin erkən orta əsr abidələrinin materiallarına bənzəyir. Bu analogiyalar əsasında antropomorf qabın IV-VI əsrlərə aid olduğu göstərilir.

1975–1976-ci illərdə Şamaxı rayonunun Çöl-Bağırlı kəndi yaxınlığında Şərqyah abidəsinin arxeoloji qazıntıları zamanı insan başı formasında hazırlanmış qabın qapağının dəstəyi tapılmışdır. Tapıntı küp-qəbirdən nəşət edir. Saçları hörülmüş və başında papaqsayağı yığılmışdır. Burnu çıxıntı-donqar burun şəklində göstərilmiş, dəyirmi yapma düyməciklərlə isə gözləri təsvir edilmişdir. Gözləri təsvir edən dəyirmi yapmaların ortasında nöqtəli çuxur vardır, bunlar gözü təsvir edir, bəbəyi təsvir edən nöqtəli çuxur nəzərə çarpır. Saç düzümündən və üzünün quruluşundan görünür ki, təsvir qadına məxsusdur. Kompleksin oturacağında, o cümlədən sarsanilər şahının adından zərb edilmiş sikkələrdən göründüyü kimi, qəbir IV-VII əsrlərə aiddir.

İnsan bədəni şəklində korpusu olan antropomorf qab Mingəçevirdə 1949-cu ildə qazıntılar zamanı tapılmışdır. Başqa antromorf qablardan fərqli olaraq, bu qabın başı göstərilməmişdir. Döşləri kiçik çıxıntılarla göstərilmişdir. Fiqurun sağ əli qaba şəkildə düzəldilmiş çıxıntı ilə göstərilmiş, sol əlini isə, ehtimal ki, qabın dəstəyi əvəz etmişdir. Sarı gildən hazırlanmış və bişirilmişdir. Hündürlüyü 5,5 sm, korpusunun diametri 4,6 sm-dir.

1948-ci ildə Mingəçevirdə qazıntılar zamanı başsız hazırlanmış antropomorf qab aşkar edilmişdir. Qabın boğazı, heykəlcikdə olduğu kimi, insan boynu şəklindədir, boynunda nöqtələrlə həmail göstərilmişdir. Arxa tərəfdə korpusda çıxıntı vardır. Əlləri göstərilmişdir. Fiqurun hündürlüyü 5,5 sm, korpusun diametri 4,2 sm-dir.

1969-cu ildə Qəbələdə 1,8 m dərinlikdə bir qoç fiquru tapılmışdır. Qoçun başı yaxşı təsvir edilmişdir, buynuzları tamamilə qopmuş, onların ancaq izləri qalmışdır. Sinəsi qabarıqdır. Hər iki qabaq ayağı tamamilə qopmuşdur. Sınığına görə güman etmək olar ki, fiqurcuq qabın dəstəyində, yaxud çiynində yerləşmişdir. Fiqurcuq sxematik üslubda hazırlanmış və yalnız heyvanın cinsini bilməyə imkan verir ki, bu da ayinin kontekstinə əsaslanmaqla tamamilə kifayət idi.

Azərbaycanda antik dövrün abidələrinin tədqiqi zamanı insan heykəlcikləri zahiri görkəminə görə fərqlənir. Onlar müxtəlif rayonlarda aşkar edilsə də, onların hazırlanma texnikası (hamısı əl ilə düzəldilmişdir) və bədənin hissələri arasında uyğunluq yoxdur. Bu, təkcə Azərbaycanın deyil, həm də bütün Ön və Orta Asiyanın plastikasının təzahürləri üçün səciyyəvidir.

Cənubi Qafqazda həmin dövrün heykəlcikləri də Gürcüstan və Ermənistan abidələrinə bənzəyir.

Ayini, simvolik və dekorativ heykəltəraşlığın ən yüksək çiçəklənmə dövrü məişət predmetlərində və bəzək əşyalarında qədim dövrə təsadüf edir. Azərbaycanın tarixi ərazisində Manna, Midiya, Atropatena və Albaniya kimi qədim dövlətlərin mövcud olduğu dövrlər formaların hərtərəfli işlənilməsi və estetikləşdirilməsi ilə səciyyəvi olan xırda antropomorf və zoomorf heykəltəraşlıq təsvirlərinin fəal surətdə yaradılması ilə səciyyələnir.

Xeyrin və şərin ayini mübarizəsi və insanın xeyir qüvvələrə qurban verilməsi ilə səciyyəvi olan Zərdüştilik bu dövrün ən geniş yayılmış dini olmuşdur. Müqəddəs içki xoma şəklində qurbanvermələr xeyirin qüvvələrini artırır və beləliklə, insanı xeyirlə şərin kosmik mübarizəsinin iştirakçısına çevirirdi.

Məlum olduğu kimi, bu dövlətlərin dini sistemlərində, demək olar, bütün tanrılar və ruhlar öz heyvani təcəssümünə malik idi, ayini və məişət predmetlərində onların mövcudluğu bu tanrıların ilahi manasının (qüvvəsinin, kəramətinin) varlığının rəmzi idi.

Bununla bərabər, bəzək-məişət əşyalarında heykəltəraşlıq obrazları çox vaxt sahiblərini bəd ruhlardan qoruyan tilsimlər və mühafizlər rolunu yerinə yetirirdi.

Zəncirlə asılan tunc şir fiqurlu bu cür sinəbəndlərdən biri Həsənludakı qəbirdə aşkar edilmişdir. Fiqurcuq formaların üslublaşdırılması ilə tökmə metodu vasitəsilə hazırlanmış və oturmuş şiri təsvir edir. Şirin bədəninin, ayaqlarının, yalının formalarının plastik emalı ornamentləşdirilmiş, bunun nəticəsində fiqurcuq müəyyən dekorativ cizgilər kəsb etmişdir. Tədqiqatçı O.Muskarela hesab edir ki, bu fiqurlu asma bəzək tilsimbənd idi (3.42–47). Həsənluda aşkar edilmiş bu cür şir fiqurcuqları çoxsaylı bürünc sancaqların başcıqlarını da bəzəyir.



*71. Bürünc həmail. Həsənlu, e.ə. IX əsr.*

Qızıl, gümüş və bürünc mərasimi qablar əlahiddə qrup təşkil edir; bu qrupda heyvan heykəlcikləri qabın bütün semantik kontekstini müəyyən edir. Bu cür qablarda heykəltəraşlıq fiqurcuqları, bir qayda olaraq, həcmli zərbetmə üsulu ilə düzəldilirdi. Bu qrupa həm

zoomorf qablar, həm də elə qablar daxildir ki, onlarda heyvan başcığı zərbetmə üsulu ilə hazırlanaraq, qabın gövdəsinə yapışdırılırdı.

İranın şimal-qərbində (Cənubi Azərbaycan) Amlaş şəhərciyində aşkar edilmiş və Metropoliten muzeyində saxlanan məşhur kasa şirlərin həcmli başcıqlarının yapışdırıldığı kasayabənzər qızıl qabın çox gözəl nümunəsidir. Qabın gövdəsindən çıxıntı halında uzanan qorelyefşəkilli şir başcıqları əks-tərəflərə yönəldilmişdir. Şirlərin ağızlarında dəliklər (axar) vardır ki, bunların vasitəsilə xomanın mərasimi axıdılması ayini baş verirdi. Heyvanların bədənləri alçaq relyefdə hazırlanmışdır və qabın səthi ilə "axıdılır". Kasanın yan səthini örtən qorelyef başcığı ilə ustalıqla birləşdirilməsi göz qabağındadır. Şir fiqurcuqlarının relyefi şirin yalını, svastikasını (günəş nişanı), sağrısını və onun fiqurunun konturlarını rəsm edən qravürləşdirilmiş və zərb edilmiş xətlərlə zənginləşdirilmişdir.

Bu tipli kasa müqəddəs qurbanlıq xomanın təqdim olunması üçün mərasimi kasaların böyük qrupuna aiddir.

*72. Zoomorf qab, gümüş. Ziviye (Zeyvə), e.ə. VIII-VII əsrlər.*



Heyvan və ya insan şəklində düzəldilmiş qablarda heykəltəraşlıq plastikasının, tamamilə başqa bir nümunəsi müşahidə olunur. Çox vaxt bu cür qabları əslində qab adlandırmaq çətindir, çünki onlar daha çox əllərində kiçik qablar tutan heyvanların və ya insanın heykəlcikləri kimi nəzərə çarpır. Burada biz müqqəs xomanın qurban verilməsi ayinini icra edən heyvan simasında tanrının və ya ruhun rəmzi təsviri ilə qarşılaşırıq. Bu cür heykəltəraşlıq qablarının nümunələri Ziviyədə və Mərlikdə (Cənubi Azərbaycan) çoxlu miqdarda aşkar edilmişdir.

Ziviyədə aşkar edilmiş gümüş qab diz çökmüş vəziyyətdə qalan və qarşısında qabaq dırnaqları ilə maye tökmək üçün balaca lüləsi olan xırda qab tutmuş inək şəklində düzəldilmişdir. Bütövlükdə bütün fiqurcuq inək simasında qurban verilən qadın obrazını təmsil edir. Ornamental zolaqları olan qadın donunu təsvir edən, heyvanın bədənində çəkilmiş qravürlər bunu göstərir. İnək fiqurcuğu tamamilə realistcəsinə hazırlanmışdır, amma yalnız yarıya qədər. İş burasındadır ki, diqqətlə baxılanda aydın olur ki, burada usta inək bədəninin üst yarısını qadın bədəninin aşağı yarısı ilə orijinal surətdə birləşdirərək,

bununla da heykəlin zoomorf və antropomorf sintezini mənaca çox aydın və bədii təsirinə görə güclü sintezini yaratmışdır. Heykəltəraşın burada istifadə etdiyi metod, şəksiz, mərasimin semantikasının tələbindən irəli gəlmişdir.

Mərlikdə aşkar edilmiş keramik fiqurlu qab qurbanvermə üçün əllərində xırda qabı qaldıran kişini üslublaşdırılmış şəkildə təsvir edir. İnsan fiquru tamamilə mücərrəd halda hazırlanmışdır və üzün şərti cizgiləri və qısa ayaqlar ilə butulkayabənzər fiqurdan ibarətdir. Çəhrayı gilin səthi rənglə boyanmışdır və geyim ornamentinin imitasiyasını əks etdirir. İnsan fiqurunun içi boşdur, hündürlüyü 18 sm-dir. Belə bir cəhət tamamilə aydındır ki, qarşımızdakı adorantı təsvir edən fiqurlu qabdır. Qədim Şərq mədəniyyətləri üçün əhalinin məbədlərdə qoyulan öz "əvəzedicilərini" bu cür hazırlaması qədim Şərq mədəniyyətləri üçün səciyyəvidir. İstisna deyildir ki, fiqurcuq mərhumun özünü (qəbirdə tapıldığına görə) təsvir edir və o əbədi olaraq, axirət dünyasında qurbanvermə ayinini icra etməli olacaqdır.

Nəhayət, zoomorf qablar, içərisində heykəlin əsas formayaradan başlanğıc kimi mövcud olduğu ən böyük qablar qrupudur. Bu qablar özlüyündə bu və ya digər heyvanın və ya quşun içiboş keramik fiqurcuqlarıdır; onlar bununla birlikdə mərasimi qab funksiyalarını yerinə yetirir.

Ördək şəklində qablar zoomorf qabların ən çoxsaylı qrupunu təşkil edir. Əcdadlarımızın "Avesta"da qeydə alınmış dini-mifoloji təsəvvürlərinə görə, suquşu, konkret dedikdə isə, ördək demiurqdur (dünyanın və həyatın yaradıcısı). Mifik (kosmik) ördəyin bu rolu dünyanın yaranması haqqında kosmoqonik miflərdə təsbit edilmişdir. Digər tərəfdən, ördək həyat, məhsuldarlıq və məhəbbət ilahəsinin – Anahidin əsas reinkarnasiyalarından biridir. Anahid suların və deməli, həyatın da ilahəsi sayılır. Ördək şəklində qabın xüsusi simvolikası da buradan irəli gəlir. İçərisində sakral simvolikada su olan ördəyəbənzər qab həyatın mənbəyi və simvoludur.

Ördək şəklində olan qablar, bir qayda olaraq, maye tökmək üçün lüləyi olan kuzədən ibarətdir. Ördəyin başı və dimdi-

*73. Keramik riton. Mingəçevir, e.ə. I əsr.*



yi adətən mayenin axıdılması üçün lüləkdir, halbuki ördəyin bədəni içərisində su olan səhəngin əsas həcmidir. Bu cür səhənglərdə ördəyin ayaqları adətən təsvir olunmur, çünki səhəng-ördək həmişə suda üzən quşu təsvir edir, elə bir quş ki, onun ayaqları görünmür. Bu cür səhənglərdən bəzilərinin dəyirmi dibi vardır ki, bu da qabı hamar səthə qoymağa imkan verir, lakin elələri də var ki, onların ayaq şəklində dibi yoxdur və xüsusi altlıqlar – qurbangahlar (tripod) nəzərdə tutulmuşdur.

*74. Taxtın bürünc ayağı. Zaqatala, Naxçıvan, III-IV əsrlər.*



Ördəkvari qablar Kür və Araz çayları arasında, Şimali Azərbaycanda və Cənubi Azərbaycanın Təpə-Sialk şəhərciyində geniş yayılmışdı. Bu tipli Mingəçevir tapıntıları geniş və dar boğazı və qabın boğazını gövdəsi ilə birləşdirən dəstəyi olan boz gildən hazırlanmış monoxrom keramikadan ibarətdir. Heykəl yapması realizmlə və şərtiliklə xarakterizə olunur. Realistcəsinə yaradılmış quş-qablar arasında səciyyəvi Kür–Araz keramikasının pardaxlanmış qara rəngli nümunələri də vardır.

Boz rəngli gil qab ördəyi daha şərti təsvir edir və məhsuldarlıq rəmzi olan nöqtəli motivə malik üçbucaqların sıraları ilə dekorasiya edilmişdir. Bu qabın iki dəstəyi vardır və bu adətən onu göstərir ki, qab asılırmış.

Ördək şəklində keramik qablarla yanaşı, kürsü üzərində dayanan ördəyin keramik içiboş fiqurcuqları da vardır. Bu cür fiqurcuqlar zoomorf qabda müşahidə olunan funksional xüsusiyyətlərə malik deyildi. Bu keramik heykəltəraşlıq nümunələri daha çox məhsuldarlığı təmin edən tilsimbəndlər rolunu yerinə yetirirdi. Qablardan fərqli olaraq, onlar həqiqətə daha çox uyğunluğu və quşun formalarının, xırda detallarının plastik işlənilməsi ilə xarakterizə edilir.

Bu cür ördək-qabın polixrom nümunəsi Cənubi Azərbaycanda Ziviyə şəhərciyində tapılmışdır, eramızdan əvvəl 8–7-ci əsrlərə aid edilir və Metropoliten muzeyində saxlanılır. Quş formalarının realist yapması və rəngli divar naxışları real ördəyin tam duyumunu yaratmışdır. Yalnız quşun bel hissəsindən boy ataraq, qabın yuxarıya doğru genişlənən hündür boğazı qabın funksionallığını göstərir. Ördəyin gözləri, dimdiyi və qanadları rənglə rəsm edilərək, realizm kamillik dərəcəsinə çatdırılmışdır. Qabın axarı dimdiyin ucundakı dəlik vasitəsilə icra olunur. Qabın müəllifi quşun mükəmməl proporsiyalarını və formalarını tipinə görə çaydanabənzər qabın funksional xüsusiyyətləri ilə ustalıqla sintezləşdirə bilmişdir. Qabın və quş heykəlinin formalarının tamlığı və kamilliyi ustalığın nadir nümunəsidir. Atı təsvir edən zoomorf qablar nüsxələrinin sayına görə ördəkdən sonra ikinci yerdədir. Bu qablar arasında elələri vardır ki, özləri at fiquru

şəklində düzəldilmişdir, habelə elə qablara rast gəlinir ki, onların üzərində at başı yapışdırma heykəl şəklində nəzərə çarpır.

Qədim dövrdə atın simvolikası müqəddəs "Avesta"da açılıb göstərilir. "Avesta"ya görə, yağış və rütubət tanrısı reinkarnasiya edib, quraqlıq gətirən kürən atdan (Apaoşi) fərqli olaraq, ağ at (Tiştriya) şəklində gəlir (4.447.517).

Mifoloji və ayini kontekstdən çıxış edərək, ehtimal etmək olar ki, at formasında, at protomalı qabdan yağışın və rütubətin çağırılması mərasimində istifadə edilirdi.

Boz gildən hazırlanmış, Ziviyədə tapılmış çaynikvari qab at fiqurcuğu şəklində qabın parlaq nümunəsidir. At fiqurcuğu olduqca şərti hazırlanmışdır və əsasən, uzunboyunlu başından tanınır. Atın belindən qabın boğazı "boy atır", ona dəstək yapışdırılmışdır. Qabın qabaq ayaqlar arasında olan və fallos şəklində qayırılmış boruyabənzər lüləyi, habelə heyvanın boynundakı yapma halqa semantika və zoomorf qabın təyinatı nöqteyi-nəzərindən daha maraqlıdır.

Ayinin (qab onun üçün yaradılmışdır) kontekstində fallosun semantikası münbitləşdirmə ideyası ilə bağlıdır. Yağışın fallosdan axıtdığı rütubət həyat və məhsuldarlıq bəxş edir. Həmçinin, ola bilər ki, at şəklində (Tiştriya) qabdan yağışın çağırılması mərasimində istifadə edilmişdir. İmitativ magiyanın prinsipinə görə, qabdan nazik şırnaqla tökülən suyun səsi eyni hadisəyə səmadan tökülən su şırnağına səbəb olmalı idi. Bu qabın heç də təkcə atı təsvir etmədiyinə heyvanın boynundakı halqa da dəlalət edir. Bu cür yapma halqalara biz ördəyəbənzər qabların boyunlarında da rast gəlirik. Tunc dövründən başlayaraq heyvanın boynunda halqa həmişə bu heyvanın seçilməsinin (ilahiliyinin) əlaməti olmuşdur. Bu cür halqa təkcə keramikadan hazırlanmış zoomorf qablarda deyil, habelə bürünc asma bəzək əşyasında – ördək və ya at şəklində tilsimbəndlərdə də vardır.

Bu cür qabın hazırlanması ideyası isə boz gildən hazırlanmış digər zoomorf qabda (bu da Ziviyədə aşkar edilmişdi) bir qədər başqa cür həll edilmişdir. Burada biz təkcə at fiqurcuğu ilə deyil, onun belində əyləşmiş insanla qarşılaşırıq. İnsan fiqurcuğu qabın boğazı rolunu yerinə yetirir. Qaba mayenin doldurulması insan fiqurunun başındakı dəlik vasitəsilə mümkün olmuş, maye-

*75. Bürünc şamdan fraqmenti. Laçın, I əsr.*



nin tökülməsi prosesi isə, birinci halda olduğu kimi, at fiqurcuğunun qabaq hissəsində fallosabənzər borucuqvari dəlik vasitəsilə icra olunmuşdur. Birinci halda atın ayaqları da şərti hazırlanmış və daha çox qısa ayaqlar-dayaqlardan qabın sabitliyi üçün nəzərdə tutulmuşdur. Atlının fiquru və sifəti mücərrəd, portret reallığına əsla işarə edilmədən hazırlanmışdır. Ola bilsin, burada yağış gətirən Tiştriya tanrısının obrazı kortəbii yağış qüvvəsini himayə edən Ameşa Spentanın (Ölməz müqəddəs) antropomorf obrazı ilə tamamlanmışdır. "Avesta"ya görə, altı Spentadan (Aban) biri rütubət və su hamisidir. (35.445). Ola bilsin, məhz o, yağışı idarə edən Tiştriya (at) tanrısı obrazında təsvir edilmişdir.

Üzərində atın yalı təsvir edilmiş qab Mingəçevirdə də, eramızdan əvvəl 5–3-cü əsrlərə aid məzarlıqların birində aşkar edilmişdir. Bikonik formalı səhəng, qabın çiyninin aşağı tərəfində at başı şəklində heykəltəraşlıq yapmasına malikdir. Atın başı realistcəsinə hazırlanmışdır, o qabın dibinə baxır. Qabın çənbər şəklində ayağı yoxdur, deməli, onu şaquli surətdə yerə qoymaq mümkün deyildir. Daha çox ehtimal edilən budur ki, o da xüsusi altlıq-qurbangah üzərinə qoyulurmuş. Əvvəlki qablardan (tipinə görə) fərqli olaraq, bu qab mayenin saxlanması üçün səhəngdən ibarətdir. Mayenin tökülməsi üçün dəliyin olmaması bu fikri təsdiq edir.

Keramik qablarda olan fiqurların sayına görə at fiqurundan sonra, dağ keçisinin fiquru üçüncü yeri tutur.

Demək lazımdır ki, "Avesta" mifologiyasına görə dağ keçisi (tur) günəş tanrısının reinkarnasiyalarından (ipostasiyalardan) biridir. Bunu günəş diskində dayanan dağ keçisinin çoxsaylı təsvirləri də göstərir. Zərdüştilik mifologiyasında dağ keçisinin obrazı baharın gəlməsi və günəşin görünməsi ilə bağlıdır. Təsadüfi deyildir ki, bu obraz azərbaycanlılar tərəfindən qədim Novruz mərasimində olduğu kimi, indi də bahar bayramının qarşılanması mərasimində saxlanılmışdır. Baharın qarşılanması mərasimində keçi – günəşin, baharın rəmzidir, halbuki Kosa (Keçəl) – ölən qışın rəmzidir.

*76. Bürünc çıraq.*
*Çuxur-Qəbələ, V-VII əsrlər.*



Dağ keçisi şəklində hazırlanmış qabların bir neçə tipoloji növü vardır. Burada müşkqabı da, səhəng də, nəhayət, maye süzmək üçün çaydanabənzər qab da vardır.

Dağ keçisinin heykəltəraşlıq obrazı üslubun lokal xüsusiyyətlərindən asılı olaraq, realist və şərti-dekorativ üslubda hazırlanmışdır.

Mingəçevirdə tapılmış dağ keçisi fiqurcuğu şəklində gil müşkqabı sınmış buynuzları və heyvanın öz belində daşıdığı qapaqlı xırda qab yapışdırılmış dağ keçisinin xırda heykəltəraşlıq fiqurundan (14 sm) ibarətdir. Bu fiqur şərti hazırlanmışdır və bədənində olan magik döymə təsvirlər mərasim heyvanın varlığına dəlalət edir.

Mingəçevirdə aşkar edilmiş dağ keçisi şəklində qara rənglə boyanmış çaynikvari qab heyvanın belindən "boylanan" boğaza malik kifayət qədər realstcəsinə dağ keçisinin içiboş fiqurcuğudur. Heyvanın sifəti qabdan mayenin axıdılması üçün nazik dəliklə tamamlanır. Qabın boğazının kənarı heyvanın üslublaşdırılmış buynuzları ilə birləşmişdir. Əks tərəfdən boğaza qabın dəstəyi yapışdırılmışdır, bunun nəticəsində bitkilərin suvarılması üçün susəpəni xatırladan qab alınmışdır. Qabın funksional təyinatı, əlbəttə, məcburi qurbanvermə ayini ilə qurbanvermə mərasimi kontekstində açılır.

Maral fiqurcuğu şəklində hazırlanmış qablar da zoomorf keramikanın çoxsaylı heykəltəraşlıq qrupunu təşkil edir. Çəhrayı gildən hazırlanmış bu qab Ziviyədə aşkar edilmişdir və eramızdan əvvəl 9–8-ci əsrlərə aiddir. Heyvanın başı və boynu tamamilə realistcəsinə hazırlanmışdır. Onun sifətinin ətrafında da qabdan maye axıtmaq üçün dəlik vardır. Əvvəlki qabdan fərqli olaraq, onun dəstəyi yoxdur. Mayenin doldurulması üçün boğaz heyvanın bilavasitə belindən "boy atır". Heyvanın fiquru plastik emalsız hazırlanmışdır. Bütün plastik işləmə müəllif tərəfindən heyvan cinsinin əsas ikonik təyinedicisi olan heyvanın buynuzları ilə birlikdə onun boynunda və başında cəmləşdirilmişdir.

*77. Bürünc fiqurcuq.*
*XII-XIII əsrlər.*



Nəhayət, zoomorf fiqur keramikasının sonuncu qrupunu qablar təşkil edir. Bu qablar inək fiqurcuğu şəklində hazırlanmışdır. Çəhrayı gildən hazırlanmış qabın Albaniya dövrünə (e.ə. 2–1-ci əsrlər) aid edilir və Mingəçevirdə aşkar olunmuşdur. Tipoloji cəhətdən o həmçinin qurvermə ayinləri üçün çaydanabənzər qabların böyük qrupuna daxildir. Heyvanın buynuzları sınmışdır, lakin bu heyvanın cinsini öyrənməyə mane olmur, onun bədənində həmçinin magik töymə təsvirlər vardır.

Qədim Azərbaycanın heykəltəraşlıq keramikasında heyvanların fiqurcuqları (əsasən, öküz fiqurcuqları) şəklində gil qəlyanları təşkil edir. Qəlyanlardan ətirli otların məstedici rayihəsinin sinəyə çəkilməsi üçün istifadə olunur. Bu cür ayini sinəyəçəkmə mərasimi (əsasən, gözdəymədən qorunmaq üçün) indi də qüvvədədir. Sinəyəçəkmə prosesində qurudulmuş ətirli üzərlikdən istifadə olunur.

Bu cür zoomorf gil qəlyanlar Cənubi Azərbaycanın Mərlik şəhərciyinin məzarlıqlarında çoxlu miqdarda aşkar edilmişdir. Cöngələrin içiboş fiqurcuqları şəklində hazırlanmış qəlyanların adətən heyvanın bədəninin aşağı hissəsində olan yarıqları vardır, halbuki heyvanın sifəti, bir qayda olaraq, açıq ağız şəklində hazırlanır, oraya qurudulmuş ətirli otlar qoyulurdu. Açıq ağız içiboş bədən vasitəsilə birləşdirilirdi və beləliklə, ətirli otun daim tüstülənməsini təmin edən hava axını mümkün olurdu. Bütün bunabənzər qəlyanlarda cöngə fiqurcuğu üslublaşdırılmış tərzdə hazırlanmışdır və heyvan yalnız səciyyəvi buynuzlarına görə tanınır.

Ayini və mərasimi predmetlərlə yanaşı, heykəltəraşlıq elementləri bir sıra məişət predmetlərində də vardır. Bu cür məmulatda heykəltəraşlıq nümunələri sırf dekorativ, bəzəyici xarakter daşıyır. Bu məmulatı bəzəyən müxtəlif insanların və heyvanların başcıqları və fiqurcuqları, əsasən, tökmə metodu ilə hazırlanmışdır.

Bu cür heykəltəraşlıq nümunələri haqqında tunc çırağın dəstəyini bəzəyən, Qəbələ rayonunun Çuxur-Qəbələ kəndində aşkar edilmiş insan başcığına əsasən təsəvvür əldə etmək mümkündür. Qadın başının xarakteri, üzünün quruluşu və saç düzümünün tipii onu göstərir ki, qarşımızdakı öz kökləri ilə qədim yunan heykəltəraşlığına gedib çıxan ellinləşdirilmiş obrazdır.

İnsan maskası şəklində eynilə belə bir ellinləşdirilmiş obraz Laçın rayonunda tapılmışdır (e.ə. I əsrə aid edilir). Güman olunur ki, bu kiçik tunc heykəl çıraq bəzəyi imiş.

Yunan mifoloji obrazlarının mövcudluğu bunu da göstərir ki, həmin şeylər gətirilmədir, yaxud yerli ustalar tərəfindən yunan heykəlciklərinin təqlidi kimi hazırlamışdır.

Ayini predmetlərdə və məişətdə işlədilən predmetlərdə dekorativ və simvolik heykəltəraşlığın inkişafına yekun vuraraq, demək lazımdır ki, heykəltəraşlar diqqəti zoomorf və antropomorf obrazların simvolik və dekorativ üslublaşdırılması üzərində cəmləşdirmişlər. Heykəltəraşları (dulusçuları) insanın və ya heyvanın plastik və təsviri xarakteristikalarının real əks etdirilməsi maraqlandırmamışdır. Bu heykəllər həmişə yalnız rəmzlər rolunu oynamışlar, bu isə, öz qövbəsində, heykəltəraşlıq obrazının üslublaşdırılması prosesində azadlığa və təxəyyülə yol açırdı.

# NƏTİCƏ

Minilliklərlə tarixi olan Azərbaycan bütpərəstlik heykəltəraşlığı Azərbaycanda plastika sənətinin yaranması və inkişafı ibtidai və qədim dövrdə sosial-tarixi, dini və bədii-estetik təfəkkürün öyrənilməsi üçün çox maraqlı materialdır.

Özünün bütün inkişafı ərzində bir çox ayin və mərasimlərin çox mühüm tərkib hissəsi olan tariximizin bütpərəstlik dövrünün heykəltəraşlığı heykəlqayırma ənənələrinin formalaşmasında dedikcə böyük rol oynamış və istər Vətənimizin, istərsə də xarici ölkələrin muzey kolleksiyalarında saxlanılan külli miqdarda misilsiz plastika nümunələri vermişdir.

Bütpərəstlik heykəltəraşlığının ayini-ideoloji əsasları bütövlükdə dünyanın bütün xalqları və regionları üçün universaldır. Heykəltəraşlıqla əks olunmuş ən erkən ayin yer üzündə bütün canlı varlığın Ulu nənəsi Böyük İlahə-Anadır. O, ibtidai təfəkkürdə Ulu ana obrazı kimi qavranılırdı. Qadının reproduktiv qabiliyyəti heykəltaraşlıqda rəmzi ümumiləşdirmə və ilahiləşdirmə xarakteri kəsb edirdi, elə bir heykəltaraşlıq ki, ona sitayiş edir və qurban verirdilər.

Nəslin himayədarları olan ulu əcdadların ayini kişi cinsinin daş monumental idollarının hazırlanması ilə xarakterizə olunurdu. Cəmiyyətdə qəbilə-tayfa münasibətlərinin yarandığı dövrdə yaşamış əcdadlarımızın dualist dünyagörüşü kişi-əcdadın obrazını yaratmışdır ki, hər qəbilə-tayfa başlanğıcını ondan götürmüşdür...

Dəfn mərasimlərində heykəltəraşlıq obrazlarına çox böyük əhəmiyyət verilirdi. Ölənin heykəltəraşlıq təsviri sxematik, şərti təsvirdən realist, portret təsvirinə doğru müvəffəqiyyətlə inkişaf edirdi. Bütpərəstlik heykəltəraşlığı inkişafının bu xətti, bununla belə, öz qəti inkişafını kəsb edə bilmədi. Erkən orta əsrlərdə Azərbaycanda yayılmış monoteist İslam bu tendensiyanın inkişafını uzun müddət dayandıraraq, heykəltəraşlıq məfhumun özünə yasaq qoydu.

Totemik ayin də bütpərəstlik heykəltəraşlığının mühüm ayini-ideoloji əsasıdır, elə bir ayin ki, orada heyvanın rəmzi ilk əcdadın obrazı qəbilələrin və tayfaların mürəkkəb çuğlaşmasında eyniləşdirici başlanğıc kimi düşünülürdü.

Xronoloji cəhətdən ibtidailiyi, qədim dövrü və erkən orta əsrləri əhatə edən bütpərəstlik dövrünün heykəltəraşlığı meydana gəldiyi andan müəllifin və heykəltəraşlıq idoluna sitayiş edən daşda, gildə, yaxud bürüncdə maddiləşmiş, insanların dünyagörüşünü əks etdirən ayini obyektin funksiyasını yerinə yetirirdi.

Tarixi inkişafın gedişində matriarxatın patriarxatla əvəz olunması bütpərəstlik heykəltəraşlığının məzmununda və formasında öz izini qoymuşdur. Cəmiyyətin sosial quruluşlarının, həyat tərzinin və ideoloji prioritetlərin bu tarixi əvəzolunma prosesi gedişində bütpərəstlik heykəltəraşlığı növlərinin

mürəkkəbləşməsi və difereniasiyası baş verirdi. Plastikanın formal və semantik keyfiyyətlərinin ən çox duyulan sınayıcısı plastikanın monumental və kamera xassələrinin yaranmasında ifadə olunmuşdur ki, bunlar da gildən, daşdan, yaxud metaldan heykəltəraşlıq məmulatının hazırlanması zamanı müxtəlif texnoloji proseslərin yaradılması ilə nəticələnmişdir. Bütpərəstlik heykəltəraşlığının bədii-plastik xassələrinə təkcə məmulatın hazırlanması üçün istifadə edilən material deyil, habelə heykəltəraşlıq məmulatının hazırlanmasında istifadə olunan təsviri rəmzi, yaxud dekorativ üslubun seçimi də təsir göstərirdi.

Mezolit dövrünün (orta daş dövrünün) daşdan hazırlanan heykəltəraşlıq məmulatı rəmzi mengirəbənzər, zəif emal olunmuş, antropomorf obraz kimi yalnız şərti qavranılan formalara meyil edirdi. Qobustanda aşkar edilmiş bu cür hykəltəraşlıq nümunələri daha çox yalnız zorla sezilən insan cizgilərinə malik daş stela kimi qavranılan idol fiqurunun və başının cizgilərinin zəif işlənilməsinə aparıb çıxaran plastik formaların şərtiliyini göstərir.

Neolit və Eneolit dövrünün əkinçilik sivilizasiyalarının yaranmağa başlaması bişirilən gil qabların ixtira olunmasına dəlalət edirdi ki, bu da heykəltəraşlığın daha da inkişafına dəxi dərhal təsir göstərdi. Forma və ölçülərinin kameralığı ilə xarakterizə olunan bişirilmiş gil heykəltəraşlıq məmulatı (terrakota) meydana gəlir. Bununla bərabər, heykəltəraşlıq məmulatının məzmunu da dəyişir, onda artıq yaşayış məskənlərinin xarabalıqlarında təsadüf edilən çılpaq qadın idollarının kiçik (15 sm-dək) gil heykəlcikləri üstünlük təşkil etməyə başlayır. Əgər daha konkret desək, artıq bu cür heykəltəraşlıq məmulatı, əsasən, ev ocağının yanında, yaxud döşəmə döşənəyinin altında basdırılmış halda var idi. Bu cür heykəltəraşlıq məmulatının məzmunu və olduğu yer bunu göstərir ki, qadın heykəlcikləri bəd ruhların fitnə-fəsadlarının qarşısını alan mühafizlər funksiyalarını yerinə yetirir, habelə məhsuldarlığı və evdə firavanlığı təmin edirdilər. Mingəçevirin, İsmayıllının, Qəbələnin qədim yaşayış məskənlərində və digər yerlərdə aşkar edilmiş gil heykəltəraşlıq məmulatı bəzən buğda unu, yaxud dənləri ilə qarışdırılırdı. Bütün bunlar evin sakinləri üçün firavanlığı təmin edən həmin fiqurcuqların magik-ayini xarakterini bir daha təsdiq edir.

Tunc və dəmir dövrü daş kişi və zoomorf heykəltəraşlıq fiqurlarının yayılması ilə xarakterizə olunur. Birincilərin peyda olması və yayılması matriarxatın patriarxatla əvəz olunması ilə bağlı idi; Patriarxat dövründə cəmiyyətdə kişinin rolu xeyli artır. Özlüyündə aydındır ki, ali tanrılar da, ruhlar da kişi cinsindən olurlar. Bu cür heykəltəraşlıq plastikası, bir qayda olaraq, monumentallığa və sxematikliyə meyil edir. Burada idolun mövcudluğu faktının özü daha vacib idi, nəinki onun təsviri keyfiyyətləri.

Bu dövrün heykəltəraşlıq nümunələri, əsasən, kurqan və başqa qəbir tikililərində qoyulur. Bu zaman meydana gəlmiş nəslin əcdadları – himayədarları ayini erkən orta əsrlərə qədər öz mövcudluğunu davam etdirəcəkdir.

Zoomorf heykəltəraşlığın yayılması bu dövrdə qəbilələrin və tayfaların mənşəyi haqqında totemik təsəvvürlərin inkişafı ilə bağlıdır. Totemlər heç də təkcə ulu əcdadlar deyil, həm də qəbilə və tayfaların mühafizləri idi. Bu və ya

digər totemi təsvir edən zoomorf heykəltəraşlığın yaradılmasının zəruriliyi də buradan irəli gəlmişdir. Azərbaycanda aşkar edilmiş öküz, at, dağ keçisi, quş və balıq fiqurcuqları şərti, sxematik tərzdə hazırlanmışdır. Heyvanın növü və ya cinsi, əsasən, buynuzların forması ilə nəzərə çarpdırılırdı. Etiraf etmək lazımdır ki, dırnaqlı heyvanların ən ikonik hissəsi onların başları və buynuzlarıdır, qədim heykəltəraşlar da, əsasən, buna diqqət yetirirdilər. Heyvanın bədəninin qalan hissələri şərti hazırlanırdı. Azərbaycanın bütpərəstlik heykəltəraşlığı heyvanın bədəninin yapılmasından və qəliblənməsindən tamamilə imtina edilməsi faktlarına malikdir. Heykəltəraşlıq baxımından işlənilmiş heyvan başı özlüyündə bütöv heyvanın keyfiyyətlərinə malik idi. Bu faktlar simvolik təsviri təfəkkürün və animistik dini təsəvvürlərin birikməsinə dəlalət edir ki, onlar üçün tilsimbənd, yaxud mühafiz rolunu yerinə yetirən totemin simvolik obrazının mövcudluğu kifayət idi.

Azərbaycanın tarixi ərazisində sivili zaseyaların və ilk dövlət birliklərinin birikməsi ilə səciyyələnən qədimlik dövrü bütpərəstlik dövrü heykəltəraşlığının inkişafının çox maraqlı dövrüdür.

Mərlikdə, Ziviyədə, Təpə-Hissarda (Cənubi Azərbaycan) aşkar edilmiş antropomorf və zoomorf heykəltəraşlıq nümunələri fiqurcuqların formalarının, ölçülərinin və detallarının şərtiliyi ilə xarakterizə olunan simvolik və magik heykəltəraşlığın birikməsinə dəlalət edir. Bu heykəltaraşlıqda onun simvolik məzmunu daha mühüm olmuş, buna görə də, əslində, heykəltəraşlıq realizmi bu şərtiliyə və simvolizmə qurban verilmişdir.

Qədim dövrdə dekorativliyi ilə xarakterizə olunan bütpərəstlik plastikası inkişafının yeni xətti də öz inkişafına başlayır. Bu cür abidələrdə heykəltəraşlıq obrazının simvolik məzmunu məişət predmetlərinin və ayini predmetlərin dekorativ, bəzək funksiyaları ilə sintezləşirdi: heykəltəraşlığın yayılması nöqteyi-nəzərindən Azərbaycan tarixinin ən zəngin dövrlərindən biri eramızdan əvvəl 4-cü – eramızın 7-ci əsrlərini əhatə edən Albaniya dövrüdür. Antik və erkən orta əsrlər Albaniyasında monumental daş və xırda gil heykəltəraşlığının geniş inkişafı alban tayfalarının qəbilə ayini ilə əkinçilik-maldarlıq ukladı üçün ən universal məhsuldarlıq ayini ilə bağlıdır. Bir çox alban tayfalarının köçəri həyat tərzi nəticəsində qədim Albaniyanın bütpərəstlik heykəltəraşlığının ənənələri Ön və Orta Asiyanın köçəri tayfalarının ənənələri ilə ən sıx surətdə çulğaşmışdır. Albaniyanın və Orta Şərqin daş idollarının tipoloji şarlığı tədqiqatçılara bu cür heykəltəraşlıq məmulatı hazırlamış tayfaların və xalqların qohumluğu haqqında danışmaq imkanı vermişdir.

Azərbaycanda bütpərəstlik heykəltəraşlığının inkişafı tarixinə ekskurs şərtiliklə simvolizmlə və realizmlə xarakterizə olunan heykəltəraşlıq ənənələrinin irəliyə doğru uzun sürən inkişafına dəlalət edir. Bütpərəst heykəltəraşlar tərəfindən işlənib hazırlanmış ənənələr, üsullar və vərdişlər əcdadlarımızın plastik təfəkkürünün formasına və xarakterinə işıq saçan çox zəngin irsimizi təşkil edən zəngin və özünəxas ənənələrdə sintezləşmişdir.

## ƏDƏBİYYAT


1. *Azərbaycan Tarixi Muzeyinin 50 illiyi. P.Əzizbəyovanın redaktəsi ilə. B., "Elm", 1973.*
2. *Babayev İ.A., Əhmədov Q.M. Qəbələ. B., "Elm", 1981, 68 s.*
3. *Əfəndiyev R.S. Azərbaycanın bədii sənətkarlığı dünya muzeylərində. B., "İşıq", 1980, 166 səh.*
4. *Qazıyev S.M. Qəbələdə aparılmış arxeoloji tədqiqat və qazıntıların ilk yekunları. Azərbaycanın maddi mədəniyyəti. VI cild, B., Azərbaycan Elmlər Akademiyasının nəşriyyatı, 1965, 322 s.*
5. *Həbibullayev O. Kültəpədə arxeoloji qazıntılar. B., Azərbaycan Elmlər Akademiyasının nəşriyyatı, 1959, 134 s.*
6. *Muradova F.M. Qobustan tunc dövründə B., "Elm", 1979, 118 s.*
7. *Osmanov F.L. İsmayıllı rayonu ərazisində tapılmış antik dövr antropomorf fiqurlar haqqında. Azərb. SSR EA-nın Xəbərləri (tarix, fəlsəfə və hüquq seriyası), 1971, №1.*
8. *Xəlilov C.Ə. Ağyazıda arxeoloji qazıntılar. Azərbaycanın maddi mədəniyyəti. X cild. B., "Elm". 1987, 167 s.*
9. *Arkeoloji ve sanat. №118. Kasim-Aralik 2004, mart Matbaaçılık, İstanbul. 128 s.*
10. *Eski dünyanın yetmiş büyük gizemi. İstanbul. Oğlak yayınları 2002. 304 s.*
11. *Ekrem Akurqal Anadolu Kültür Tarihi. "Tübitak", Ankara. 2003. 417 s.*
12. *Oktay Arslanara. Türk Sanatı. 6 Basım. "Remzi kitabevi", İstanbul. 2003. 453 s.*
13. *Oktay Belli. Kırşızıstanda taş ve insan biçimli heykellerö Arkeoloji ve sanat yayınları. İstanbul. 2004, 166 s.*
14. *Abramova Z.B. Изображения человека в палеолитическом искусстве Евразии. М. -Л., "Наука", 1966, 273 с.*
15. *Азербайджанские сказки. Т.2. Баку, "Азернешр", 1962, 286 с.*
16. *Алекперов А.И. Терракота древнего Азербайджана. Б., "Элм", 1994, 133 с.*
17. *Ализаде А. Некоторые сведения о Ширване. "Известия" Академии наук Азерб. ССР. 1947, №12.*
18. *Асланов Г. Об археологических памятниках Абшерона. Сб. Материальная культура Азербайджана. Т.9. Б. Элм. 1980. 191 с.*
19. *Анисимов А. Этапы развития првобытной религии. М.-Л., 1967, 267 с.*
20. *Астарта. Вып. 2. Женщина в структурах власти архаических и традиционных обществю. Под ред. М.Ф.Альбедиль, А.В.Цыба. Изд-во СПб университета, 1999, 126 с.*
21. *Ашурбейли С.Б. Скульптура Азербайджана древнего периода и периода средневековья в кн. "Труды музея истории Азербайджана". Вып. 1. Баку, Издательство Академии наук Азербайджана, 1956.*
22. *Ашурбейли С. История города Баку, 1992, "Азернешр", 402 с.*

23. *Байбурин А.К., 1989. Семиотические аспекты функционирования вещей. Этнографическое изучение знаковых средств культуры. Л., 1989, 185 с.*
24. *Батчаев В.М., Керефов Б.М. Оленный камень из Кабардино-Балкарии. – Журнал "Советская археология", Москва, 1980, №3, с. 289–294.*
25. *Бибиков С.Н. Культовые женские изображения племен Юго-Восточной Европы. Советская Археология. 1951. Т. 15. 340 с.*
26. *Бичурин И. Собрание сведений о народах, обитавших в Средней Азии в древние времена. М., 1950, т. I, стр. 230.*
27. *Войтов В.Е. Каменные изваяния из Унгету, "Сборник Центральная Азия. Новые памятники письменности и искусства". Москва, 1987, 169.*
28. *Гильом де Рубрук. Путешествие в восточные страны. "Восточная литература". М., 1957, с.107–103.*
29. *Грач А.Д. Древнетюркские изваяния Тувы. М., 1961.*
30. *Гумилев Л.Н. Алтайская ветвь тюрок-тугю. журн. Советская археология. 1959, №1, 145 с.*
31. *Дебиров П.М. Резьба по камню в Дагестане. М., "Наука", 1966.*
32. *Древние изваяния Сибири. Путеводитель. Новосибирск, Наука, 1980.*
33. *Евтюхова Л.А. Каменные изваяния Южной Сибири и Монголии. МИА СССР, №24, 1952;*
34. *Есаян С.А. Скульптура древней Армении. Ереван, изд-во АН Арм. ССР. 1980, 75 с.*
35. *Зорастрийская мифология. Санкт-Петербург. ИТД "Летний сад", 1988, 559 с.*
36. *История армянского народа. Ч. I. Ереван, "Эребуни", 1951.*
37. *Кесаманлы Г.П., Ямпольский З.И. Историко-археологический комплекс из села Ибрагим Гаджили Азербайджанской ССР. Советская Археология, 1966, №1.*
38. *Кобзев А.И. Учение о символах и числах в китайской классической философии. М., 1993.*
39. *Крупнов Е.И. Глиняная головка "скифа" из Закавказья. Вестник древней истории. М., 1940, № 3–4. 430 с.*
40. *Кругликова И.Т. Идолы из Дильберджина // История и культура античного мира, М., "Наука", 1977, с. 87–91.*
41. *Кубарев В.Д. Древнетюркские изваяния Алтая. Новосибирск, М., "Наука", 1984, 196 с.*
42. *Кызласов Л.Р. О значении термина балбал древнетюркских надписей. М.: Наука, ГРВЛ, 1996. 348 с.*
43. *Кызласов Л.Р. О назначении тюркских каменных изваяний, изображавших людей. – СА, 1964, №2.*
44. *Леви-Брюль Л. Первобытное мышление. М., 1930, с. 270.*
45. *Масон В.М. Первые цивилизации. Л., "Наука". 1989, 274 с.*
46. *Марковин В.И., Мунчаев Р.М. Каменные изваяния Чечено-Ингушетии. "Советская Археология", 1964, №1.*

47. *Максимова М.И. Античные фигурные вазы, т. I. М., "Апполон", 1916, 283 с.*
48. *Мень А. Истоки религии. М., 1983, 352 с.*
49. *Мурадова Ф.М. Гобустан в эпоху бронзы. "Елм", Б., 1979, 118 с.*
50. *Моисей Каланкатуйский. История Агван. Б., 1993, "Елм". 270 с.*
51. *Османов Ф.Л. Терракоты Азербайджана античной эпохи и их ближневосточные параллели. Сб. Искусство и археология Ирана. М., 1971.*
52. *Пластика и рисунки древних культур. М., "Искусство", 1983, 195 с.*
53. *Путешествие Ибн Фадлана на Волгу. М., 1964.*
54. *Ранние формы искусства. Сборник статей. М., "Искусство", 1972, 478 с.*
55. *Первобытное искусство. Антропоморфные изображения.*
56. *Расим Эфенди. Каменная пластика Азербайджана. Баку, "Ишыг", 1986.*
57. *Рзаев Н.И. Искусство Кавказской Албании. Б., 1976, "Елм", 254 с.*
58. *Рзаев Н.И. Искусство Кавказской Албании. Б., 1976, "Елм", 254 с.*
59. *Рыбаков Б.А. Космогония и мифология земледельцев энеолита. СА, 1, 1965, стр. 42.*
60. *Седых В.Н., 2000. Святилища, кумиры, храмы… // Святилища: археология ритуала и вопросы семантики. Материалы конф. СПб., 2000 с.*
61. *Сеидов Мирали. По следам оланга. "Азербайджан", 1965, № 12.*
62. *Тайлор Э.Б. Первобытная культура. М., Издательство Политической литературы, 1989. 573 с.*
63. *Токарев С.А. Ранние формы религии. М., Издат. Политич. литерат. 1990, 621 с.*
64. *Топоров. О ритуале Введение в преблематику. Архаический ритуал вя фольклорных и раннелитературных памятниках. М., 1988. 295 с.*
65. *Топоров В.Н. Ранние формы искусства. М., "Искусство", 1971, 235 с.*
66. *Фрезер Дж. Золотая ветвь. Исследование магии и религии. М., "Политиздат", М., 1968, 265 с.*
67. *Федоров-Давыдов Г.А. Курганы, идолы, монеты. "Советское искусство", М., 1968, 265 с.*
68. *Федоров-Давыдов Г.А. Искусство кочевников и Золотой Орды. "Искусство", М., 1976, 226 с.*
69. *Халилов М.Дж. Древние святилище, связанные с каменными изваяниями у с. Шатырлы. "Доклады АН Азербайджана", т. XIII, №7, 1986, с. 78–82.*
70. *Халилов М.Дж. Каменные изваяния Азербайджана / II пол 1 тыс. до н.э. – 1 тыс. н.э. / Автореф канд. дисс. Москва, 1988. Хишам ибн Мухаммад ал-Калби. Книга об идолах (китаб ал-аснаб).*
71. *Шер Я.А. Каменные изваяния Семиречья. Москва-Ленинград, 1966, 160 с.*
72. *Шульц П.Н. Скифские изваяния Причерноморья. Сборник "Античное общество". Москва, 1967, с. 225–237.*
73. *Элиаде М. Религии Австралии. М., "Планета", 275 с.*
74. *Элиеде М. Космос и история. М., 1987, с. 200.*
75. *Этнографическое изучение знаковых средств культуры. Л., 1989, с. 83.*

76. *Andre Leroi-Gourhan. Prehistoric Art and Civilization. New York "Abrahams Publishers". 1968, 359 p.*
77. *Negahban O. Marlik. Philadelphia 1966, Album, 230 pages.*
78. *A.Poupe. Masterpiesses Arts of İslam. New-York, 1981, vol. 2–4.*
79. *R.H.Dyson, Jr. Sciences Meet in Ancient Hasanlu. New-York. 1960, 236 p-s.*
80. *Muskarella O.W. Bronze and İron. Ancient Near Eastern Artifacts in the Metropolitan Muzeum of Art. New-York. 1988, 501 p-s.*
81. *Mellart J. Chatal Huyuk, A Neolitic Town in Anatolia, London, 1967, p. 150.*
82. *Kleiss W. Siedlunget und Burgen in Azerbaidjan. Archaeologiche Mitteilongen aus İran "Berlin", N.F 8. 1975, S. 345.*

# İLLÜSTRASİYALARIN SİYAHISI

42. "Bayıl" daşlarının relyefləri. Bakı, XII-XIII əsrlər.
43. Qoç şəklində qəbirüstü daş heykəl. Qazax, XV əsr.
44. At şəklində qəbirüstü daş heykəl. Şirvan, XVI əsr.
45. Terrakota fiqurcuqları. Molla-İsaqlı, İsmayıllı, I-II əsrlər.
46. Terrakota fiqurcuqları. Füzuli I-II əsrlər.
47. Terrakota fiqurcuqları. Molla-İsaqlı, İsmayıllı, I-II əsrlər.
48. Terrakota fiqurcuqları. Gil fiqurcuqlar. Qəbələ, I-III əsrlər.
49. Zoomorf heykəl. Xanlar, III-IV əsrlər.
50. Tunc maral fiqurcuqları. Naxçıvan, Mingəçevir, Dəvəçi, e.ə. I minillik.
51. Tunc öküz başcıqları. Həsənlu, e.ə. XI-IX əsrlər.
52. Tunc balıq fiqurcuğu. Bakı, e.ə. I minillik.
53. Tunc quş fiqurcuğu. Çovdar, e.ə. I minillik.
54. Terrakota heykəli. Qızılvəng, Naxçıvan, III-VII əsrlər.
55. Terrakota fiqurcuğu. Xınıslı, Şamaxı, I-II əsrlər.
56. Tunc insan fiqurcuğu. İbrahim-Hacılı, Tovuz, e.ə. I minillik.
57. Tunc fiqurcuq. Əmircan, Bakı, Antik dövr.
58. Terrakota fiqurcuqları. Molla-İsaqlı, İsmayıllı, I-III əsrlər.
59. Keramik zoomorf qab. Mingəçevir, e.ə. II minillik.
60. Keramik zoomorf qab. Ziviye, e.ə. IX-VIII əsrlər.
61. Fiqurlu qab. Həsənlu, e.ə. IX-VIII əsrlər.
62. Fiqurlu qab. Mingəçevir, e.ə. V-III əsrlər.
63. Zoomorf qab. Mingəçevir, e.ə. IV-III əsrlər.
64. Daş fiqurlu kassa. Mingəçevir, e.ə. II minillik.
65. Fiqurlu keramik qab. Mingəçevir, e.ə. IV-III əsrlər.
66. Zoomorf keramik qab. Ziviye, e.ə. VIII-VII əsrlər.
67. Zoomorf keramik qab. Ziviye, e.ə. VII əsr.
68. Zoomorf keramik qab. Ziviye, e.ə. VII əsr.
69. Fiqurlu keramik qab. Həsənlu, e.ə. II minillik.
70. Tunc heykəl. Qarabağ, e.ə. IX əsr.
71. Bürünc həmail. Həsənlu, e.ə. IX əsr.
72. Zoomorf qab, gümüş. Ziviye, e.ə. VIII-VII əsrlər.
73. Keramik riton. Mingəçevir, e.ə. I əsr.
74. Taxtın bürünc ayağı. Zaqatala, Naxçıvan, III-IV əsrlər.
75. Bürünc şamdan fraqmenti. Laçın, I əsr.
76. Bürünc çıraq. Çuxur-Qəbələ, V-VII əsrlər.
77. Bürünc fiqurcuq. XII-XIII əsrlər.

